QƏZET 01.02.1958-ci İLDƏN ÇIXIR

# GƏNC MÜƏLLİM

**BEŞİKDƏN QƏBİR EVİNƏDƏK ÖYRƏNİN!**
*Məhəmməd Peyğəmbər (S.)*

Yanvar 2018 № 1 (1088)

AZƏRBAYCAN DÖVLƏT PEDAQOJİ UNİVERSİTETİNİN QƏZETİ



## 2018-ci ilin Azərbaycan Respublikasında “Azərbaycan Xalq Cümhuriyyəti İli” elan edilməsi haqqında

### *Azərbaycan Respublikası Prezidentinin Sərəncamı*

1918-ci il mayın 28-də Azərbaycan xalqının həyatında misilsiz hadisə baş vermiş, Müsəlman Şərqində ilk parlamentli respublika olan Azərbaycan Xalq Cümhuriyyəti qurulmuşdur. Cəmi iki ilə yaxın yaşamış Azərbaycan Xalq Cümhuriyyəti zəngin dövlət quruculuğu təcrübəsi ilə milli dövlətçilik tarixində silinməz izlər qoymuş, xalqın qəlbində azadlıq və istiqlal duyğularını gücləndirməklə respublikanın gələcək müstəqilliyi üçün etibarlı zəmin hazırlamışdır.

2018-ci ildə Azərbaycan Xalq Cümhuriyyətinin yaranmasının 100-cü ildönümü tamam olur. Bu əlamətdar hadisənin dövlət səviyyəsində layiqincə qeyd edilməsi məqsədilə Azərbaycan Respublikası Prezidentinin “Azərbaycan Xalq Cümhuriyyətinin 100 illik yubileyi haqqında” 2017-ci il 16 may tarixli 2867 nömrəli Sərəncamına əsasən, Azərbaycan Respublikasının Nazirlər Kabinetinə müvafiq tədbirlər planının hazırlanıb həyata keçirilməsi tapşırılmışdır. Bu tədbirlərlə yanaşı, Azərbaycan Xalq Cümhuriyyətinin yaranmasının 100-cü ildönümü ilə əlaqədar ölkədə və ölkə xaricində silsilə tədbirlərin həyata keçirilməsi nəzərdə tutulmuşdur.

Azərbaycan Respublikası Konstitusiyasının 109-cu maddəsinin 32-ci bəndini rəhbər tutaraq **qərara alıram:**

2018-ci il Azərbaycan Respublikasında “Azərbaycan Xalq Cümhuriyyəti İli” elan edilsin.

**İlham Əliyev,**
**Azərbaycan Respublikasının Prezidenti**
*Bakı şəhəri, 10 yanvar 2018-ci il*

# Payız semestrinin imtahan sessiyası

**Azərbaycan Respublikasının Təhsil naziri vəzifələrini müvəqqəti icra edən nazir müavini Ceyhun Bayramovun “İmtahan sessiyasının təşkili və keçirilməsi barədə” imzaladığı 19 dekabr 2017-ci il tarixli 438 nömrəli əmrdə ali və orta ixtisas təhsili müəssisələrində 2017-2018-ci tədris ilinin payız semestrinin imtahan sessiyasının mövcud qaydalara uyğun təşkil edilməsi, tələbələrin biliyinin qiymətləndirilməsində şəffaflığın və obyektivliyin təmin olunması, imtahan sessiyasının mövcud normativ sənədlər əsasında keçirilməsi, təhsil müəssisələrində imtahan qərargahlarının yaradılması, bu qərargahlara daxil olan hər bir şikayətin qısa müddətdə çevik şəkildə araşdırılıb lazımi tədbir görülməsi, eyni zamanda imtahanlarda şəffaflığın təmin edilməsi üçün ictimaiyyətin və tələbələrin valideynlərinin iştirakına şərait yaradılması öz əksini tapıb.**



Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) bu əmrin icrası ilə bağlı payız semestrinin imtahan sessiyasında yazılı və VTS-TEST sistemi üzrə tələbələrin imtahan nəticələrinin qiymətləndirilməsində olan şikayətləri araşdırmaq və düzgün qiymətləndirməni təmin etmək məqsədilə Apelyasiya Komissiyası, həmçinin fakültələr, Magistratura və doktorantura şöbəsi üzrə apelyasiya komissiyaları yaradılıb, fakültə dekanlarının, kafedra müdirlərinin və digər struktur bölmələrin həyata keçirəcəkləri vəzifələr müəyyən edilib. Sessiyanı normal mənəvi-psixoloji şəraitdə, obyektiv başa çatdırmaq üçün bütün hazırlıq işləri və təşkilati məsələlər vaxtında yekunlaşdırılıb, imtahanların keçirilməsi üçün lazımi sənədlər tələblərə uyğun hazırlanıb. İmtahan sessiyasının təşkil edilməsi və keçirilməsi üçün bütün fakültələrin əməkdaşlarından ibarət olan İşçi qrupu yaradılıb. Apelyasiya Komissiyası ADPU-nun Üzeyir Hacıbəyli küçəsi, 68 ünvanındakı I nömrəli tədris binasının II mərtəbəsində, 247 nömrəli otaqda fəaliyyət göstərir. Apelyasiya Komissiyasının telefon nömrəsi 498-17-94-dür. Apelyasiya Komissiyasının sədri dosent Zahir Kazımovdur. Eyni zamanda universitetdə İmtahan Qərargahı yaradılıb. İmtahan Qərargahı və qaynar xətt **(qaynarxett@adpu.edu.az)** də universitetin Üzeyir Hacıbəyli küçəsi, 68 ünvanındakı I nömrəli tədris binasının II mərtəbəsində, 204 nömrəli otaqda fəaliyyət göstərir. İmtahan Qərargahının telefon nömrəsi 498-19-04-dür. İmtahan Qərargahının rəhbəri dosent Rasim Şükürovdur. Bunlarla yanaşı, imtahanlara buraxılma, imtahanların təşkili, keçirilməsi qaydaları, imtahan koordinatorların vəzifələri, hüquqları və tələbələrin imtahanın gedişində hansı hərəkətlərə yol verməmələri barədə elanlar vurulub. İmtahan Qərargahının və Apelyasiya Komissiyasının əlaqə telefonları bütün tələbələrə elan edilib və universitetin saytında yerləşdirilib. İmtahan Qərargahına daxil olan hər bir şikayətin qısa müddətdə çevik araşdırılıb təmin edilməsi, imtahanların təşkilində və gedişində mənfi hallara yol vermiş şəxslər barədə universitetin rəhbərliyinə mütəmadi məlumat verilməsi tapşırılıb. Fakültələr, eləcə də Magistratura və doktorantura şöbəsi üzrə imtahanların gedişinə nəzarət edəcək imtahan rəhbərlərinin, nəzarətçi-müəllimlərin, apelyasiya komissiyalarının tərkibi müəyyən edilib. İmtahan rəhbərləri və nəzarətçi-müəllimlər qeyri-ixtisas sahibləridir. İmtahanlar hər gün saat 9:00-da başlayır, 17:30-da bitir. Yazılı imtahanlar gün ərzində 3 dəfə - saat 9:00, 12:00, 15:00-da keçirilir. Test üsulu ilə hər 45 dəqiqədən bir imtahanlar keçirilir. Payız semestrinin imtahan sessiyasının əyani təhsil forması üzrə yanvarın 5-dən fevralın 2-dək, qiyabi təhsil forması üzrə isə yanvarın 5-dən 18-dək keçirilməsi nəzərdə tutulub.

İmtahan zallarında yanaşı oturan müxtəlif fakültələrin tələbələri ayrı-ayrı fənlərdən imtahan veriblər. Bu da onların bir-birinə kömək etmələrinin qarşısını alıb. İmtahanların nəticələrinin təlimata müvafiq olaraq tələbələrə çatdırılması təmin edilib. İmtahanların keçirildiyi binada qayda-qanunlara riayət olunmasını təmin etmək üçün professor-müəllim heyətinin tərkibindən fakültələr üzrə növbətçilər müəyyənləşdirilib. ADPU-nun filialları və ADPU-nun nəzdində Azərbaycan Dövlət Pedaqoji Kolleci (ADPK) imtahan sessiyasının gedişi haqqında mütəmadi olaraq Tədrisin İdarə Olunması və Tədris Texnologiyaları Mərkəzinə və rektorluğa məlumat veriblər.

Qeyd edək ki, ötən tədris ilindən başlayaraq ADPU-ya qəbul olunmuş I tədris ilinin tələbələrinin və arzu edən digər tədris ilinin tələbələrinin kollokvium və semester imtahanları yazılı qaydada aparılır. Məqsəd tədrisin keyfiyyətini yüksəltmək, şəffaflığı və obyektvliyi təmin etmək, eyni zamanda tələbə-gənclərin məntiqi təfəkkürünün, yaradıcı təxəyyülünün inkişaf etdirilməsinə və onların yazı mədəniyyətinin formalaşmasına kömək etməkdir. Digər tədris ili tələbələri isə Kompüter Mərkəzində elekron-test üsulu ilə imtahan verirlər. Yazılı imtahanların yoxlanılması üçün xüsusi otaqlar ayrılıb. Yazılı imtahanlar başa çatdıqdan sonra yazılar şifrələnir, yoxlanılır və həmin gün qiymətlər tələbələrə elan olunur. Günün sonunda isə bütün imtahanlarının nəticələri ADPU-nun İnternet saytına yerləşdirilir. İmtahandan aldığı qiymətlə razılaşmayan tələbələr fakültələr və universitet üzrə yaradılmış apelyasiya komissiyalarına, həmçinin İmtahan Qərargahına müraciət edə bilərlər. Eyni zamanda valideynlərlə əlaqələrin yaradılmasına, təhsil sahəsində fəaliyyət göstərən qeyri-hökumət təşkilatlarının və kütləvi informasiya vasitələri nümayəndələrinin ADPU-da olaraq imtahan prosesini izləmələrinə də xüsusi diqqət yetirilir ki, bu da ictimaiyyətdə imtahanların gedişi barədə dolğun təsəvvürün formalaşdırılmasına xidmət edir.

ADPU-nun rəhbərliyi auditoriyalarda olaraq imtahan prosesini müşahidə edir, imtahanların çevik, şəffaf və obyektiv keçirilməsi üçün öz tapşırıq və tövsiyələrini verib.

**Mənsur İbrahimli**

# Payız semestrinin imtahan sessiyasının monitorinqi

Yanvarın 11-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) fəaliyyət göstərən İctimai Şura 2017-2018-ci tədris ilinin payız semestrinin imtahan sessiyasının monitorinqini keçirib. Monitorinqdə İctimai Şuranın üzvləri: "Konstitusiya" Araşdırmalar Fondunun prezidenti Əliməmməd Nuriyev, həmin fondun proqram rəhbəri Nailə İsmayılova, "Azərbaycan müəllimi" qəzetinin baş redaktoru Nurəddin Heydərov, təhsil eksperti, fəlsəfə doktoru Etibar Əliyev, Korrupsiyaya Qarşı Mübarizə Fondunun icraçı direktoru Vasif Mövsümov, Əmək Hüquqlarının Müdafiəsi Liqasının sədri Sahib Məmmədov, Şəmsi Əsədullayev Xeyriyyə İctimai Birliyinin icraçı direktoru Cəsarət Hüseynzadə, ADPU-dan İctimai Şuranın üzvü, Həmkarlar İttifaqı Komitəsinin sədri, dosent Vaqif Əliyev, Azərbaycan dili və onun tədrisi metodikası kafedrasının müdiri, professor Əzizxan Tanrıverdiyev və kütləvi informasiya vasitələrinin (KİV) nümayəndələri iştirak ediblər. Monitorinqin keçirilməsində məqsəd ictimaiyyəti ADPU-da payız semestrinin imtahan sessiyasının keçirilməsi ilə bağlı geniş və ətraflı məlumatlandırmaq olmuşdur. Qeyd etmək lazımdır ki, ölkəmizdə həyata keçirilən təhsil islahatlarının əsas istiqamətlərindən biri olan ictimai iştirakçılığın miqyasının genişləndirilməsinə və bütövlükdə təhsilin keyfiyyətinin yüksəldilməsinə xidmət edən bu monitorinqlərin ADPU-da ardıcıl keçirilməsinə xüsusi diqqət yetirilir.





Monitorinqdən öncə ADPU-nun rektoru, professor Cəfər Cəfərov İctimai Şuranın üzvləri və KİV nümayəndələri ilə görüşüb. Rektor bildirib ki, müəllim hazırlığı ölkənin milli təhlükəsizlik məsələsidir. ADPU-da həyata keçirilən yeniliklər, islahatlar məhz ölkəmiz üçün yüksəkixtisaslı pedaqoji kadrlar hazırlanmasına xidmət edir. Təhsilin məzmununun yenilənməsi və keyfiyyəti əsas diqqət mərkəzindədir. Universitetdə infrastrukturun yenilənməsinə, maddi-texniki bazanın gücləndirilməsinə, idarəetmənin optimallaşdırılmasına və insan resurslarının inkişaf etdirilməsinə böyük önəm verilir.

Sonra payız semestrinin imtahan sessiyası barədə məlumat verən rektor qeyd edib ki, Azərbaycan Respublikasının Təhsil naziri vəzifələrini müvəqqəti icra edən nazir müavini Ceyhun Bayramovun "İmtahan sessiyasının təşkili və keçirilməsi barədə" imzaladığı 19 dekabr 2017-ci il tarixli 438 nömrəli əmrdə ali və orta ixtisas təhsili müəssisələrində 2017-2018-ci tədris ilinin payız semestrinin imtahan sessiyasının mövcud qaydalara uyğun təşkil edilməsi, tələbələrin biliyinin qiymətləndirilməsində şəffaflığın və obyektivliyin təmin olunması, imtahan sessiyasının mövcud normativ sənədlər əsasında keçirilməsi, təhsil müəssisələrində imtahan qərargahlarının yaradılması, bu qərargahlara daxil olan hər bir şikayətin qısa müddətdə çevik şəkildə araşdırılıb lazımi tədbir görülməsi, eyni zamanda imtahanlarda şəffaflığın təmin edilməsi üçün ictimaiyyətin və tələbələrin valideynlərinin iştirakına şərait yaradılması öz əksini tapıb. ADPU-da bu əmrin icrası ilə bağlı payız semestrinin imtahan sessiyasında yazılı və VTS-TEST sistemi üzrə tələbələrin imtahan nəticələrinin qiymətləndirilməsində olan şikayətləri araşdırmaq və düzgün qiymətləndirməni təmin etmək məqsədilə Apelyasiya Komissiyası, həmçinin fakültələr, Magistratura və doktorantura şöbəsi üzrə apelyasiya komissiyaları yaradılıb, fakültə dekanlarının, kafedra müdirlərinin və digər struktur bölmələrin həyata keçirəcəkləri vəzifələr müəyyən edilib. Sessiyanı normal mənəvi-psixoloji şəraitdə, obyektiv başa çatdırmaq üçün bütün hazırlıq işləri və təşkilati məsələlər vaxtında yekunlaşdırılıb, imtahanların keçirilməsi üçün lazımi sənədlər tələblərə uyğun hazırlanıb. İmtahan sessiyasının təşkil edilməsi və keçirilməsi üçün bütün fakültələrin əməkdaşlarından ibarət olan İşçi qrupu yaradılıb. Apelyasiya Komissiyası ADPU-nun Üzeyir Hacıbəyli küçəsi, 68 ünvanındakı I nömrəli tədris binasının II mərtəbəsində, 247 nömrəli otaqda fəaliyyət göstərir. Apelyasiya Komissiyasının telefon nömrəsi 498-17-94-dür. Apelyasiya Komissiyasının sədri dosent Zahir Kazımovdur. Eyni zamanda universitetdə İmtahan Qərargahı yaradılıb. İmtahan Qərargahı və qaynar xətt **(qaynarxett@adpu.edu.az)** də universitetin Üzeyir Hacıbəyli küçəsi, 68 ünvanındakı I nömrəli tədris binasının II mərtəbəsində, 204 nömrəli otaqda fəaliyyət göstərir. İmtahan Qərargahının telefon nömrəsi 498-19-04-dür. İmtahan Qərargahının rəhbəri dosent Rasim Şükürovdur. Bunlarla yanaşı, imtahanlara buraxılma, imtahanların təşkili, keçirilməsi qaydaları, imtahan koordinatorların vəzifələri, hüquqları və tələbələrin imtahanın gedişində hansı hərəkətlərə yol verməmələri barədə elanlar vurulub. İmtahan Qərargahının və Apelyasiya Komissiyasının əlaqə telefonları bütün tələbələrə elan edilib və universitetin saytında yerləşdirilib. İmtahan Qərargahına daxil olan hər bir şikayətin qısa müddətdə çevik araşdırılıb təmin edilməsi, imtahanların təşkilində və gedişində mənfi hallara yol vermiş şəxslər barədə universitetin rəhbərliyinə mütəmadi məlumat verilməsi tapşırılıb. Fakültələr, eləcə də Magistratura və doktorantura şöbəsi üzrə imtahanların gedişinə nəzarət edəcək imtahan rəhbərlərinin, nəzarətçi-müəllimlərin, apelyasiya komissiyalarının tərkibi müəyyən edilib. Tələbələrin imtahan sessiyasının gedişi ilə bağlı rəylərini öyrənmək, baş verə biləcək mənfi halların qarşısını almaq məqsədilə universitetdə "Arzu və təkliflər qutusu" hazırlanıb, tələbələrin öz fikirlərini bildirmələri üçün şərait yaradılıb.

İmtahan rəhbərləri və nəzarətçi-müəllimlər qeyri-ixtisas sahibləridir. İmtahanlar hər gün saat 9:00-da başlayır, 17:30-da bitir. Yazılı imtahanlar gün ərzində 3 dəfə saat 9:00, 12:00, 15:00-da keçirilir. Test üsulu ilə hər 45 dəqiqədən bir imtahanlar keçirilir. Gün ərzində ümumilikdə təxminən 3000 nəfər tələbə yazılı və test üsulu ilə imtahan verir. Payız semestrinin imtahan sessiyasının əyani təhsil forması üzrə yanvarın 5-dən fevralın 1-dək, qiyabi təhsil forması üzrə isə yanvarın 5-dən 18-dək keçirilməsi nəzərdə tutulub.

Magistratura təhsil səviyyəsində magistrantların imtahanları yazılı şəkildə aparılır. Hər iki təhsil səviyyələrinin əyani və qiyabi təhsil formaları üzrə imtahanlar İmtahan, monitorinq və qiymətləndirmə şöbəsi tərəfindən tərtib edilmiş və təsdiqlənmiş xüsusi cədvəl əsasında təşkil olunur. İmtahan cədvəlində hər bir imtahana hazırlaşmaq üçün tələbələrə 2 gündən az olmayaraq, vaxt ayrılır. İmtahanlar əvvəlcədən təyin edilmiş auditoriyalarda keçirilir. Qeyd edək ki, sessiya müddətində universitetdə təhsilin bakalavriat səviyyəsi üzrə 367 qrupda 565 fəndən (qiyabi təhsil forması üzrə12 qrupda 33 fənn, əyani təhsil forması üzrə 355 qrupda 532 fənn) imtahan keçirilməsi nəzərdə tutulur. Magistratura səviyyəsində isə 52 qrupda təqribən 312 fəndən imtahan keçiriləcək. Yekun etibarilə 419 qrupda 877 fəndən imtahanların keçirilməsi nəzərdə tutulur.

İmtahan zallarında yanaşı oturan müxtəlif fakültələrin tələbələri ayrı-ayrı fənlərdən imtahan verirlər. Bu da onların bir-birinə kömək etmələrinin qarşısını alır. İmtahanların nəticələrinin təlimata müvafiq olaraq tələbələrə çatdırılması təmin edilir. İmtahanların keçirildiyi binada qayda-qanunlara riayət olunmasını təmin etmək üçün professor-müəllim heyətinin tərkibindən fakültələr üzrə növbətçilər müəyyənləşdirilib. ADPU-nun filialları və ADPU-nun nəzdində Azərbaycan Dövlət Pedaqoji Kolleci (ADPK) imtahan sessiyasının gedişi haqqında mütəmadi olaraq Tədrisin İdarə Olunması və Tədris Texnologiyaları Mərkəzinə və rektorluğa məlumat verirlər.

Qeyd etmək lazımdır ki, ötən tədris ilindən başlayaraq ADPU-ya qəbul olunmuş I tədris ilinin tələbələrinin və arzu edən digər tədris ilinin tələbələrinin kollokvium və semester imtahanları yazılı qaydada aparılır. Məqsəd tədrisin keyfiyyətini yüksəltmək, şəffaflığı və obyektvliyi təmin etmək, eyni zamanda tələbə-gənclərin məntiqi təfəkkürünün, yaradıcı təxəyyülünün inkişaf etdirilməsinə və onların yazı mədəniyyətinin formalaşmasına kömək etməkdir. Digər tədris ili tələbələri isə Kompüter Mərkəzində elekron-test üsulu ilə imtahan verirlər. Yazılı imtahanların yoxlanılması üçün xüsusi otaqlar ayrılıb. Yazılı imtahanlar başa çatdıqdan sonra yazılar şifrələnir, yoxlanılır və həmin gün qiymətlər tələbələrə elan olunur. Günün sonunda isə bütün imtahanlarının nəticələri ADPU-nun İnternet saytına yerləşdirilir. İmtahandan aldığı qiymətlə razılaşmayan tələbələr fakültələr və universitet üzrə yaradılmış apelyasiya komissiyalarına, həmçinin İmtahan Qərargahına müraciət edə bilərlər. Eyni zamanda valideynlərlə əlaqələrin yaradılmasına, təhsil sahəsində fəaliyyət göstərən qeyri-hökumət təşkilatlarının və KİV nümayəndələrinin ADPU-da olaraq imtahan prosesini izləmələrinə də xüsusi diqqət yetirilir ki, bu da ictimaiyyətdə imtahanların gedişi barədə dolğun təsəvvürün formalaşdırılmasına xidmət edir.

Rektor Cəfər Cəfərov çıxışının sonunda universitetdə həyata keçirilən yeniliklərə və islahatlara dəstək verən vətəndaş cəmiyyəti nümayəndələrinə və KİV əməkdaşlarına təşəkkür edib.

Sonra İctimai Şuranın üzvləri, KİV nümayəndələri imtahan keçirilən zal və auditoriyalarda olaraq imtahan prosesini, həmçinin imtahan yazı işlərinin kodlaşdırıldığı otaqlarda olaraq imtahan yazı işlərinin yoxlanılmasını, Apelyasiya Komissiyasının və İmtahan Qərargahının fəaliyyətini müşahidə edərək, imtahan vermiş tələbələrlə söhbət ediblər. Tələbələr şəffaf və obyektiv imtahan mühitinin yaradılmasından razı qaldıqlarını bildiriblər. Sonda İctimai Şuranın üzvləri imtahan sessiyasının qanun çərçivəsində, şəffaf və ədalətli keçirildiyini vurğulayaraq tələbə-gənclərə uğurlar arzulayıblar.

**Nurlan Səmədov**

# ADPU-nun Türkiyə universitetləri ilə əlaqələri genişlənir

Yanvarın 10-da Türkiyə Respublikasının Azərbaycandakı fövqəladə və səlahiyyətli səfiri cənab Erkan Özoral Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) olub. ADPU-nun rektoru, professor Cəfər Cəfərovla görüşdə ADPU-nun 2018-ci ildə Türkiyə universitetləri ilə əməkdaşlığı, Azərbaycan və Türkiyə universitetlərinin rektorlarının növbəti görüşünün Bakıda keçirilməsi, ADPU-nun təşkil edəcəyi elmi konfranslarda türkiyəli alimlərin iştirakı, ADPU tələbələrinin qardaş ölkənin universitetlərində təhsil alması perspektivləri müzakirə edilib. Eyni zamanda Azərbaycan Xalq Cümhuriyyətinin 100 illik yubileyi çərçivəsində Qafqaz İslam Ordusunun Bakını azad etməsinin 100 illiyinin birgə qeyd olunması və s. bu kimi məsələlər ətrafında geniş fikir mübadiləsi aparılıb. Həmçinin 2017-2018-ci tədris ilində ADPU-da təhsil alan 175 nəfər Türkiyə vətəndaşı olan tələbələrin tədrisi və qarşılaşdığı məsələlər də diqqət mərkəzində olub. Görüşdə Türkiyə-Azərbaycan münasibətlərinin yüksək səviyyədə olduğu qeyd edilib.





Sonra Türkiyə Respublikasının Azərbaycandakı fövqəladə və səlahiyyətli səfiri cənab Erkan Özoral ADPU-da keçirilən imtahan sessiyası, eləcə də universitetdə son ildə aparılmış yeniliklər və islahatlarla tanış olub.

# 20 Yanvar faciəsinin iyirmi səkkizinci ildönümünə həsr edilmiş anım mərasimi



Yanvarın 18-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) 20 Yanvar faciəsinin iyirmi səkkizinci ildönümünə həsr edilmiş anım mərasimi keçirilib. Mərasimdən öncə iştirakçılar 20 Yanvar faciəsi ilə bağlı kitablardan ibarət sərgi ilə tanış olublar. Anım mərasimində ilk olaraq 20 Yanvar şəhidlərinin əziz xatirələri bir dəqiqəlik sükutla yad edilib.

Tədbiri giriş sözü ilə açan ADPU-nun rektoru, professor Cəfər Cəfərov bildirib ki, 20 Yanvar faciəsindən 28 il keçir. Qədirbilən xalqımız 20 Yanvar şəhidlərinin xatirəsini həmişə əziz tutur. Çünki onlar Azərbaycanın yenidən öz dövlət müstəqilliyini bərpa etməsində böyük rol oynayıblar.

Rektor qeyd edib ki, bizim əksəriyyətimiz 20 Yanvar hadisələrinin canlı şahidləriyik. 20 Yanvar xalqımızın azadlıq və müstəqillik uğrunda apardığı mübarizə tarixinə həm faciə, həm də qəhrəmanlıq səhifəsi kimi daxil olub. 1990-cı il yanvarın 22-də xalqımız mərdliklə şəhidlərini dəfn etdi. Xalqımızın böyük oğlu, ümummilli lider Heydər Əliyev bu faciəyə görə öz haqq səsini ucaltdı. Xalqımız informasiya blokadasının yarılması üçün mübarizə apardı. Beləliklə, Azərbaycan yenidən öz dövlət müstəqilliyini bərpa etdi. Bu faciəyə siyasi-hüquqi qiymət ulu öndər Heydər Əliyevin Azərbaycanda xalqın inadlı tələbi ilə yenidən respublika rəhbərliyinə qayıtmasından sonra verildi. Böyük dövlət və siyasi xadim Heydər Əliyevin qeyd etdiyi kimi, "Azadlığı əldə etmək nə qədər çətindirsə, onu qorumaq da bir o qədər çətindir". Azadlıq böyük nemətdir. Biz bu neməti göz-bəbəyimiz kimi qorumalı, müstəqil dövlətimizi daha da gücləndirmək üçün əzmlə, vicdanla çalışmalıyıq. Bu, bizim bütün şəhidlərimiz qarşısında müqəddəs mənəvi borcumuzdur. Müasir dünyamızda mürəkkəb beynəlxalq siyasi vəziyyət mövcuddur. Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyev müstəqil və balanslaşdırılmış xarici siyasət yürüdür. Azərbaycanın güclü iqtisadiyyatı, güclü ordusu var. Biz ölkə rəhbərliyinin həyata keçirdiyi uğurlu daxili və xarici siyasətə dəstək verməli, öz sahəmizdə layiqincə fəaliyyət göstərməliyik.

Tədbirdə Musiqi, təsviri incəsənət, fiziki tərbiyə və çağırışaqədərki hazırlıq fakültəsinin Fiziki tərbiyə və çağırışaqədərki hazırlığın tədrisi metodikası kafedrasının baş müəllimi, ehtiyatda olan kapitan Natiq Əliyev məruzə ilə çıxış edib. Məruzəçi bildirib ki, ADPU-nun müəllim və tələbələri ümumxalq hərəkatında fəal iştirak ediblər. Eyni zamanda universitetin məzunları və tələbələri Azərbaycanın ərazi bütövlüyü və dövlət müstəqilliyi uğrunda gedən döyüşlərdə qəhrəmancasına iştirak ediblər. ADPU-nun 18 şəhidi var. Onlardan 2-si xüsusi şücaət və qəhrəmanlıqlarına görə ölümündən sonra "Azərbaycanın Milli Qəhrəmanı" adına (M.İbrahimov və M.Quliyev), 2-si isə «Azərbaycan Bayrağı» ordeninə (M.Məmmədov və M.Bayramov) layiq görülüb. 20 Yanvar elə bir tarixdir ki, illər, əsrlər ötsə də, bu gün heç vaxt unudulmayacaq, yaddaşlardan silinməyəcəkdir. Xalqımıza qarşı bu bəşəri cinayəti törədənlər isə həmişə lənətlənəcəklər.

Filologiya fakültəsinin dekanı, professor Buludxan Xəlilov, Azərbaycan və dünya ədəbiyyatı kafedrasının müdiri, professor Himalay Qasımov, Ədəbiyyat və onun tədrisi metodikası kafedrasının müdiri, professor Zahid Xəlil çıxış edərək şahidi olduqları hadisələr barədə məlumat verərək 20 Yanvarı xalqımızın faciə və qəhrəmanlıq günü kimi səciyyələndiriblər.

Tədbirdə 20 Yanvar hadisələrinə həsr olunmuş videoçarx nümayiş etdirilib.

**Nigar Abbasova**

# Davamlı təhsil və təlim şöbəsi 20 Yanvar faciəsinin iyirmi səkkizinci ildönümü ilə əlaqədar tədbir keçirib



Azərbaycan Respublikası Prezidenti Administrasiyasının rəhbəri Ramiz Mehdiyevin müvafiq sərəncamı və Təhsil Nazirliyinin əmrinə əsasən 20 Yanvar faciəsinin iyirmi səkkizinci ildönümünün keçirilməsilə əlaqədar olaraq Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) tədbirlər planına uyğun olaraq yanvarın 12-də Davamlı təhsil və təlim şöbəsi 20 Yanvar faciəsinin iyirmi səkkizinci ildönümü ilə əlaqədar tədbir keçirib. Tədbirdə əvvəlcə 20 Yanvar şəhidlərinin xatirəsi bir dəqiqəlik sükutla yad edilib.



Tədbirdə Davamlı təhsil və təlim şöbəsinin müdiri, dosent Vaqif İsrafilov, baş mütəxəssis, dosent Qızxanım Qəhrəmanova, Tarix və coğrafiya fakültəsinin dekanı, dosent Şahin Pənahov və Ümumi tarix kafedrasının baş müəllimi İsaməddin Musayev 20 Yanvar faciəsinin iyirmi səkkizinci ildönümü ilə bağlı çıxış ediblər. Çıxışlarda qeyd edilib ki, Azərbaycanın azadlığı və ərazi bütövlüyü uğrunda mübarizə tarixinə qəhrəmanlıq səhifəsi kimi daxil olmuş 1990-cı ilin 20 Yanvar faciəsindən iyirmi səkkiz il keçir. 1990-cı ilin 20 Yanvarında ölkəmizə qarşı ərazi iddiaları irəli sürən Ermənistanın təcavüzkar hərəkətlərindən və keçmiş SSRİ rəhbərliyinin onlara havadarlığından hiddətlənən, Bakının küçələrinə və meydanlarına çıxaraq buna öz qəti etirazını bildirən xalqa qarşı Sovet Ordusunun döyüş hissələrinin yeridilməsi Azərbaycanda böyük faciəyə gətirib çıxardı. Həmin faciəli günlərdə öz ölkəsinin, xalqının azadlığını, şərəf və ləyaqətini hər şeydən uca tutan mərd Vətən övladları canlarından keçərək şəhidlik zirvəsinə ucaldılar.

Tədbirdə "İnformatika müəllimliyi" ixtisasının dinləyicisi Elvin Əsədov, "Tarix müəllimliyi" ixtisasının dinləyicisi Əlican Sultanov, "İbtidai sinif müəllimliyi" ixtisasının dinləyiciləri Gülnarə Miriyeva, Vüsalə Abbasova və "Fizika müəllimliyi" ixtisasının dinləyicisi Şəbnəm Mazakova qanlı 20 Yanvar faciəsinə həsr olunmuş şeirlər söyləyib və bu dəhşətli hadisə haqqında fikirlərini bölüşüblər.

Tədbirdə 20 Yanvar qətliamına aid slaydlar, mahnılar və videoçarx təqdim edilib.

# Elm və innovasiyalar şöbəsinin "Dünyamızın 28 dərd ili..." mövzusunda tədbiri



Yanvarın 18-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Elm və innovasiyalar şöbəsi Azərbaycan Respublikası Prezidenti Administrasiyasının rəhbəri Ramiz Mehdiyevin sərəncamı və Təhsil Nazirliyinin müvafiq əmrinə əsasən 20 Yanvar faciəsinin iyirmi səkkizinci ildönümünün qeyd edilməsi üçün nəzərdə tutulan tədbirlərin həyata keçirilməsini təmin etmək məqsədilə və ADPU-nun tədbirlər planına müvafiq olaraq azadlıq uğrunda mübarizədə həlak olmuş şəhidlərin xatirəsinə həsr edilmiş "Dünyamızın 28 dərd ili..." mövzusunda tədbir keçirib. Tədbirdə Elm və innovasiyalar şöbəsinin, "Dədə Qorqud", "Koordinasion birləşmələr" elmi-tədqiqat laboratoriyalarının əməkdaşları iştirak ediblər. Tədbirdə ilk olaraq 20 Yanvar şəhidlərinin əziz xatirəsi bir dəqiqəlik sükutla yad edilib.

Tədbiri giriş sözü ilə Elm və innovasiyalar şöbəsinin müdiri, dosent Yusif Alıyev açıb. Dosent Y.Alıyev "Qəhrəmanlıq tariximizin 20 Yanvar səhifəsi" mövzusunda məruzə edərək Azərbaycan xalqının zaman-zaman faciələrlə üzləşməsindən, xalqımızın başına gətirilən fəlakətlərədən geniş söhbət açıb.

Dosent Y.Alıyev qeyd edib ki, xalqımızın başına gətirilən bu qanlı hadisəyə ilk etiraz edən ümummilli lider Heydər Əliyev olmuşdur. Heydər Əliyev 1990-cı il yanvarın 21-də faciə ilə əlaqədar Azərbaycanın Moskvadakı daimi nümayəndəliyində keçirilən yığıncaqda çıxış edərək bu hadisəni törədən şəxsləri kəskin şəkildə tənqid etdi. Heydər Əliyev bu hadisəni hüquqa, demokratiyaya yad, humanizmə və ölkədə elan olunmuş hüquqi dövlət quruculuğu prinsiplərinə zidd hesab etdiyini bildirib. Heydər Əliyev hər zaman 20 Yanvar faciəsinin mahiyyət etibarilə bəşəriyyətə, humanizmə, insanlığa qarşı yönəldilmiş ən qanlı terror aktlarından biri kimi qiymətləndirmiş, öz çıxışlarında bu dəhşətli cinayətin təşkilatçılarının və icraçılarının indiyədək cəzasız qalmasından təəssüfləndiyini ifadə etmişdir.

Sonra şöbənin baş mütəxəssisi Dilguşə Süleymanova "Dünyamızın 28 dərd ili..." mövzusunda təqdimatla tədbiri davam etdirib. Tədbir iştirakçıları bədii kompozisiya ilə çıxış edərək şəhidlər haqqında ürəkyanğısı ilə danışıblar. Onlar qeyd ediblər ki, 20 Yanvar faciəsindən 28 il ötsə də, həmin günlər hər birimizin yaddaşına əbədi həkk olunub. Həmin gün Azərbaycan tarixində qanla yazılmış bir səhifədir, bu təkcə faciə deyil. Bu tarix Azərbaycanın istiqlal yolunun ilk zirvəsi, milli məfkurəmizin azadlıq istəyinin oyanış günü idi. 1990-cı ilin 20 Yanvar günü uzun illər Sovet imperiyasının əsarətində yaşayan xalqın azadlıq səsini ucaltdığı, öz suverenliyi uğrunda cəsarət nümayiş etdirdiyi şərəfli bir tarixdir.

Xalq o günlərdə böyük bir həqiqəti - meydanda həqiqi liderin olmamasını da bütün mahiyyəti ilə dərk etdi. O müdhiş günlərdə Heydər Əliyevin - qüdrətli liderin respublikada yoxluğu günün ən böyük həqiqəti kimi dərk olundu. Amma Bakıda olmamasına baxmayaraq, xalqının səsinə hər kəsdən əvvəl səs verən də elə Heydər Əliyev oldu. Ümummilli Liderimiz Moskvada xüsusi nəzarət altında ola-ola, özünün və ailə üzvlərinin həyatını açıq təhlükə qarşısında qoyaraq, hadisələrdən dərhal sonra, 1990-cı il yanvarın 21-də silahdaşı İlham Əliyevlə birlikdə Azərbaycanın Moskvadakı daimi nümayəndəliyinə gəldi. Ulu Öndər təcavüzə kəskin etirazını bildirdi, faciəni törədənləri, şəxsən M.S.Qorbaçovu kəskin ittiham etdi, qoşunların Bakıdan çıxarılmasını tələb etdi. Şöbənin əməkdaşları bütün bunları ürəkyanğısı ilə qeyd etməyin mümkünsüzlüyünü vurğulayıblar.

# “Təhsil ixtisasları üzrə təhsil proqramlarının praktik istiqamətliliyinin yüksəldilməsi” mövzusunda seminar

Yanvarın 17-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) Filologiya fakültəsinin təşəbbüsü və təşkilatçılığı ilə “Təhsil ixtisasları üzrə təhsil proqramlarının praktik istiqamətliliyinin yüksəldilməsi” mövzusunda seminar keçirilib. Seminarda ADPU-nun rəhbərliyi, fakültə dekanları, kafedra müdirləri, müəllimlər iştirak ediblər.







Filologiya fakültəsinin dekanı, professor Buludxan Xəlilov seminarı giriş sözü ilə açaraq bildirib ki, dövlət başçımız cənab İlham Əliyevin 24 oktyabr 2013-cü il tarixli Sərəncamı ilə təsdiq edilmiş “Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası”nda təhsil ixtisasları üzrə təhsil proqramlarının praktik istiqamətliliyinin yüksəldilməsi vacib vəzifələrdən biri kimi qarşıya qoyulub. ADPU-nun rektoru, professor Cəfər Cəfərov “Təhsil ixtisasları üzrə təhsil proqramlarının praktik istiqamətliliyinin yüksəldilməsi haqqında” müvafiq əmr imzalayıb. Seminarın keçirilməsində məqsəd təhsil ixtisasları üzrə təhsil proqramlarının praktik istiqamətliliyinin yüksəldilməsi sahəsində qarşımızda duran vəzifələrin müəyyən edilməsi, fikir və təkliflərin irəli sürülməsidir. Müasir dövrümüzdə yalnız elmi-nəzəri biliklərlə kifayətlənmək məqsədəuyğun hesab edilmir. Praktikaya xidmət edən biliklərə olan ehtiyac özünü kəskin şəkildə büruzə verir. Akademik tədqiqatlar praktikaya yönəlməli, real müsbət nəticələr verməlidir.

ADPU-nun rektoru, professor Cəfər Cəfərov çıxış edərək seminarın keçirilməsini müsbət qiymətləndirib və belə seminarların bütün fakültələrdə keçirilməsinin vacibliyini vurğulayıb. Qeyd edib ki, belə seminarlar təhsilin keyfiyyətinin yüksəldilməsi üçün vacibdir. ADPU-nun professor-müəllim heyəti təhsil sənədlərinin, o cümlədən pedaqoji təhsilin standartlarının müasir tələblərə uyğun hazırlanmasında fəal iştirak etməlidir. Eyni zamanda ADPU-da bu sahədə tanınmış və nüfuzlu alim-mütəxəssislər və dərslik müəllifləri ilə mütəmadi olaraq görüşlər keçirilməli, müzakirələr aparılmalıdır. ADPU bu sahədə əsas rol oynamalıdır. Biz ixtisas-peşə səriştələrinin formalaşmasına istiqamətlənmiş və praktik müəllim hazırlığını təmin edən fənlərin orta ümumitəhsil məktəbinin məzmununda aparılan dəyişikliklərlə əlaqələndirilməsini özündə əks etdirən fənn kurikulumları hazırlamalı, məzmunun yenilənməsini, pedaqoji təhsilin təkmilləşdirilməsi üzrə bütün elmi nailiyyətləri özündə cəmləşdirən səmərəli fənn proqramlarının hazırlanmasını təmin etməliyik. Bu, qarşımıza qoyduğumuz böyük hədəflərə çatmaq və ölkəmizdə insan kapitalının formalaşmasına öz töhfələrimizi vermək üçün xüsusi önəm kəsb edir. Rektor çıxışının sonunda seminar iştirakçılarına uğurlar arzulayıb.

Seminarda iştirak edən Azərbaycan Respublikası Təhsil İnstitutunun direktor müavini, dosent Ənvər Abbasov yeni təhsil sistemi, yeni təlim texnologiyaları, standartlar və kurikulumlar, fəndaxili inteqrasiya, fənlərarası inteqrasiya, ali və ümumi təhsil sahəsində dərsliklərin elmi-metodiki baxımından təkmilləşdirilməsi ilə bağlı fikir və təkliflərini səsləndirib.

Seminarda maraqlı və səmərəli fikir mübadiləsi aparılıb və bu mövzuda seminarların ardıcıl keçirilməsi qərara alınıb.

**Könül Nəzərova**

## Fizika və texnologiya fakültəsində 20 Yanvar faciəsinin iyirmi səkkizinci ildönümü ilə bağlı tədbir

Yanvarın 17-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Fizika və texnologiya fakültəsində 20 Yanvar faciəsinin iyirmi səkkizinci ildönümü ilə bağlı tədbir keçirilib. Tədbirdə əvvəlcə fakültənin əməkdaşları və tələbələri 20 Yanvar şəhidlərinin əziz xatirələrini bir dəqiqəlik sükutla yad ediblər.





Fizika və texnologiya fakültəsinin dekanı, dosent Arzu Daşdəmirov 1990-cı il yanvarın 19-dan 20-nə keçən gecə Bakı şəhərinə və Azərbaycanın bir neçə rayonuna Sovet Ordusunun hərbi hissələrinin yeridilməsi, dinc əhaliyə divan tutulması, yüzlərlə insanın qətlə yetirilməsi, yaralanması, itkin düşməsi barədə məlumat verib.

Sonda fakültədə yeni yaradılmış Tələbə Şurasının Qanlı Yanvara həsr olunmuş videoçarxı göstərilib.

## Pedaqoji təcrübənin başlanmasına həsr olunmuş konfrans

Yanvarın 19-da Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) qiyabi təhsil forması üzrə təhsil alan tələbələrin pedaqoji təcrübəsinin başlanmasına həsr olunmuş konfrans keçirildi. Konfransda əvvəlcə 20 Yanvar şəhidlərinin xatirəsi bir dəqiqəlik sükutla yad edildi.

Konfransı giriş sözü ilə açan universitetin Tədris işləri üzrə prorektoru, dosent Eldar Aslanov pedaqoji təcrübənin başlanması münasibətilə tələbələri təbrik etdi və onlara uğurlar arzuladı. Dosent E.Aslanov tələbələrə təhsilin vacib bir komponenti olan pedaqoji təcrübənin əhəmiyyətindən danışdı. Bildirdi ki, tələbələr universitetdə oxuduqları müddətdə əldə etdikləri nəzəri bilikləri pedaqoji təcrübədə tətbiq edirlər.

Dosent E.Aslanov metodist müəllimlərin pedaqoji təcrübədə həyata keçirəcəkləri işlərin əhəmiyyətindən bəhs etməklə yanaşı, onlara da uğurlar arzuladı. O, pedaqoji təcrübənin keyfiyyətini artırmaq üçün fakültələrdə yaradılmış komissiyaların fəaliyyət istiqamətlərini nəzərə çatdırdı. Qeyd etdi ki, fakültələrdə pedaqoji təcrübə ilə bağlı komissiyanın yaradılmasında əsas məqsəd həm tələbələrə dəstək vermək, həm də pedaqoji təcrübənin obyektiv, şəffaf və keyfiyyətli keçirilməsini təmin etməkdir.







Konfransda çıxış edən Tədrisin İdarə Olunması və Tədris Texnologiyaları Mərkəzinin direktoru, dosent Sənan Əliyev təhsil prosesinin ayrılmaz hissəsi olan pedaqoji təcrübənin əhəmiyyəti və mahiyyətindən danışdı. Dosent S.Əliyev çıxışında builki pedaqoji təcrübənin digər illərdən fərqli olduğunu qeyd etdi. Bütün fakültələrin eyni vaxtda pedaqoji təcrübə keçəcəyini və bu işin çox məsuliyyətli olduğunu vurğuladı.

Filologiya fakültəsinin dekanı, professor Buludxan Xəlilov, İbtidai təhsil fakültəsinin dekanı, professor Fərrux Rüstəmov çıxış edərək tələbələrə uğurlar arzuladılar. Onlar tələbələrə pedaqoji təcrübə keçəcəkləri məktəblərdə qayda-qanunlara əməl etməyi və məktəbdə keçirilən bütün mədəni-kütləvi tədbirlərdə yaxından iştirak etməyi, tanınmış şair və yazıçılarla, elm xadimləri ilə görüşlər təşkil etməyi tövsiyə etdilər. Sonra dosent Fəxrəddin Yusifov və dosent Xankişi Məmmədov çıxış edərək pedaqoji təcrübədə olan yeniliklərdən danışdılar və tələbələrə uğurlar arzuladılar.

Konfransda tələbə-gənclər çıxış edərək öz sevinclərini bölüşdülər və ADPU-nun tələbələri olmalarından qürur duyduqlarını bildirdilər. Konfransın sonunda Fizika və texnologiya fakültəsinin tələbələri ötən ilin pedaqoji təcrübəsinin gedişini əks etdirən slayd nümayiş etdirdilər.

# "Ən yaxşı öyrətmə təcrübələri" mövzusunda dəyirmi masa

**Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) mütərəqqi beynəlxalq təcrübənin, innovativ layihə və proqramların öyrənilib həyata keçirilməsinə xüsusi önəm verilir. Bu baxımdan, yanvarın 30-da ADPU-da Amerika Birləşmiş Ştatlarının (ABŞ) Lehingh Universitetinin Fulbrayt təqaüdü üzrə eksperti, professor Jill Sperandionun iştirakı ilə "Ən yaxşı öyrətmə təcrübələri" mövzusunda keçirilən dəyirmi masa diqqəti cəlb edir. Dəyirmi masada ADPU-nun rəhbərliyi, fakültə dekanları, kafedra müdirləri, filial direktorları və müəllimlər iştirak ediblər.**



Dəyirmi masanı giriş sözü ilə açan ADPU-nun rektoru, professor Cəfər Cəfərov bildirib ki, xanım Jill Sperandion təhsil siyasəti və idarəçiliyi üzrə tanınmış və nüfuzlu mütəxəssisdir. Dünyanın bir çox ölkələrində uğurla fəaliyyət göstərib. Hazırda professor Jill Sperandion Fulbrayt proqramı çərçivəsində ölkəmizdə çalışır. ABŞ-ın Azərbaycandakı səfirliyinin dəstəyi və əldə edilmiş qarşılıqlı razılıq əsasında xanım Jill Sperandion ADPU-da 4 ay müddətində fəaliyyət göstərəcək. Professor Jill Sperandion universitetdə həyata keçirilməsi nəzərdə tutulan bir çox işlərə dəstək verəcək.

Sonra təqdimatla çıxış edən professor Jill Sperandion qeyd edib ki, ADPU böyük və zəngin tarixə malikdir. Universitetdə həyata keçirilən islahatlar, yeniliklər təhsilin müasir standartlara uyğunlaşması üçün çox vacibdir. Təhsil yalnız faktları öyrənmək, qeydə almaq, yaddaşa köçürmək deyil. Müasir dünyamızda yaddaş



məktəbindən, hafizə məktəbindən təfəkkür məktəbinə keçid prosesi gedir. Təhsil- müstəqil, yaradıcı, tənqidi düşünməyi öyrətməkdir. Çağdaş dövrümüzdə cəmiyyət sürətlə inkişaf edir, dəyişir və yeniləşir. Buna görə də cəmiyyətlə birgə təhsil və öyrətmə sistemimiz də dəyişməlidir. Biz XXI əsrin təhsil fəlsəfəsinə uyğun olaraq tələbələrdə azad seçim, ünsiyyət, yaradıcılıq, tənqidi düşüncə və əməkdaşlıq etmək bacarıqlarını formalaşdırmalıyıq. Bu bacarıqları formalaşdırmaqla biz tələbələri daha yaxşı və effektli öyrədə bilər, onların peşəkar və dinamik inkişafını təmin edə bilərik. Professor Jill Sperandion təqdimatında müasir tədris metodları barədə də ətraflı məlumat verib.

Dəyirmi masada təqdimat üzrə maraqlı və səmərəli sual-cavab sessiyası keçirilib. İştiakçıların fəallığı şəraitində keçən dəyirmi masada dosent Eldar Aslanov, professor Buludxan Xəlilov, professor Fərrux Rüstəmov, dosent Şahin Pənahov, professor Müseyib İlyasov, professor İramin İsayev, dosent Əli Zalov, dosent Gülşən Novruzova çıxış edərək professor Jill Sperandionun tədqiqatların nəticələrinə əsaslanan təqdimatını yüksək qiymətləndirərək mövzu ilə bağlı öz fikir və təkliflərini bölüşüblər.

Dəyirmi masanı yekun sözü ilə bitirən rektor Cəfər Cəfərov təqdimatda səslənən fikirlərin, irəli sürülən təkliflərin, vəzifələrin uğurla həyata keçirilməsi, tədris prosesinin səmərəli təşkili və təhsilin keyfiyyətinin yüksəldilməsi üçün öz tapşırıq və tövsiyələrini verib.

**Mahirə Mustafayeva**

# "Elektron Universitet" layihəsi çərçivəsində tədbir

Yanvarın 30-da Təhsil Nazirliyinin Azərbaycan Dövlət Pedaqoji Universiteti (ADPU) ilə birgə həyata keçirdiyi "Elektron Universitet" layihəsi çərçivəsində universitetdə tədbir keçirilib. Tədbirdə ADPU-nun rəhbərliyi, fakültə dekanları, filialların direktorları, universitetin və filialların informasiya-kommunikasiya texnologiyaları sahəsində fəaliyyət göstərən əməkdaşları və layihə üzrə məsul şəxslər iştirak ediblər.

Tədbiri giriş sözü ilə açan ADPU-nun rektoru, professor Cəfər Cəfərov bildirib ki, "Elektron Universitet" layihəsi çox vacib bir layihədir. Bu layihə ADPU-da tədris prosesinin çevik, şəffaf və obyektiv idarə edilməsinə şərait yaradır. "Elektron Universitet" sistemi vasitəsilə tələbələr tədris strukturlarını, avtomatlaşdırılmış alt sistemləri özündə birləşdirən vahid informasiya mühitində istənilən fənn üzrə materialları əldə edəcək, müəllimlərin mühazirələri ilə tanış ola biləcəklər. Son bir ildə ADPU-da "Elektron Universitet" layihəsi çərçivəsində müxtəlif işlər həyata keçirilib. ADPU-nun şəbəkələşməsi sahəsində məqsədyönlü fəaliyyət gerçəkləşdirilib.

Tədbirdə çıxış edən "Neuron Technologies" Məhdud Məsuliyyətli Cəmiyyətinin təsisçi və baş direktoru İsmayıl Ələkbərov ADPU-da "Elektron Universitet" layihəsi çərçivəsində görülən işlər



barədə məlumat verərək bildirib ki, layihə çərçivəsində İnformasiya-Kommunikasiya Texnologiyaları Şöbəsi və fakültələr tərəfindən məlumatların idarə olunması sistemində (MİS) təşkilati struktur yaradılıb, müəllimlər və universitetə daxil olmuş hər bir tələbə şəxsi və akademik məlumatları əks olunmaqla sistemə daxil edilib, qruplar yaradılıb, beynəlxalq əlaqələr qurulub və digər vacib işlər həyata keçirilib. Hazırda fakültələr və İnformasiya-Kommunikasiya Texnologiyaları Şöbəsi tərəfindən tədrisin idarə olunması sistemində (TİS) fənn kataloqunun, tədris planlarının, fənn qruplarının və soraqçaların yaradılması üzərində iş aparılır. Yekun olaraq fakültələrin qiymətləndirmə tiplərini tədris planlarına daxil etməsi, fənn qruplarını yaratması, cədvəlləri işləməsi və elektron jurnal yaratması nəzərdə tutulur. Çıxışının sonunda İ.Ələkbərov layihənin həyata keçirilməsinə verdiyi yüksək dəstəyə görə ADPU-nun rektoru, professor Cəfər Cəfərova təşəkkür edib.



Tədris işləri üzrə prorektor, dosent Eldar Aslanov, Elmi işlər üzrə prorektor, professor Asəf Zamanov, Filologiya fakültəsinin dekanı, professor Buludxan Xəlilov, Tarix və coğrafiya fakültəsinin dekanı, dosent Şahin Pənahov, Fizika və texnologiya fakültəsinin dekanı, fizika üzrə fəlsəfə doktoru Arzu Daşdəmirov, İnformasiya-Kommunikasiya Texnologiyaları Şöbəsinin müdiri Fərid Quluzadə, filialların direktorları və başqaları çıxış edərək "Elektron Universitet" layihəsinin uğurla gerçəkləşməsi və universitetin İKT infrastrukturunun təkmilləşdirilməsi ilə bağlı fikir və mülahizələrini bölüşüblər.

Rektor Cəfər Cəfərov tədbirə yekun vuraraq layihənin uğurlu icrası üçün əzmlə və layiqincə çalışmağı tapşırıb.

**Könül Nərimanqızı**

# İbtidai təhsil fakültəsində 35 ildən sonra görüş

Yanvarın 28-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) İbtidai təhsil fakültəsinin 1982-ci il məzunlarının 35 ildən sonra görüşü keçirilib. Universitetin 2 nömrəli tədris binasında keçirilən görüşü İbtidai təhsil fakültəsinin dekanı, pedaqoji elmlər doktoru, Əməkdar elm xadimi, professor Fərrux Rüstəmov açaraq tələbə yoldaşlarını salamlayıb. Görüşdə professor Fərrux Rüstəmov ADPU-nun rektoru, professor Cəfər Cəfərovun rəhbərliyi ilə universitetdə müəllim hazırlığı sahəsində aparılan islahatlardan danışıb. Sonra xatirələr dilə gəlib. Dünyasını dəyişən Rasət Poladovun, Əzizxan Mirzəyevin, Əbülfəz Bəbirovun, Mübariz Qəhrəmanovun və Gülnarə Ayvazovanın xatirələri hörmətlə anılıb. Respublikamızın müxtəlif bölgələrində, Bakı və Sumqayıt məktəblərində ibtidai sinif müəllimi işləyən Hökumə Vahabova, Bəsti Ədilova, Nərgiz Qurbanova, Xuraman Əlimərdanava, Məhəbbət Süleymanova, Adil Əliyev, Bənövşə Allahverdiyeva, Kifayət Şirinova, Mirvari Qocayeva, Yaşar Əlimərdanov, Əzizə Əsgərova, Məmləkət Hüseynova, Aidə Hüseynova, Kütahi Nəbiyeva, Akif Səmədov, Əzizə Xəlilova tələbəlik illəri ilə bağlı xatirələrini bölüşüblər. Onlar ADPU-nun məzunları olmaları ilə fəxr etdiklərini bildiriblər. Azərbaycan Yazıçılar Birliyinin üzvləri Xürrəm Qafanlı və Çingiz Əliyev tələbəlik illərini poetik dillə vəsf edib, yeni yazdıqları şeirlərini oxuyublar.



Sonra tələbəlik illərini xatırladan zəng vurulub. "Tələbələr" öz müəllimlərini gözləyib. Baxışlar qapıya dikilib... Heç vaxt dərsə geçikməyən professor Mərdan Muradxanov, professor Xəlil Fətəliyev, professor Soltansəlim Axundov, professor Seyidağa Həmidov, dosent Əyyub Tağıyev, dosent Sədrəddin Nəbiyev, dosent Nəmidə Abbasova, dosent Sabir Süleymanov, dosent Mustafa Əliyev "dərsə"- tələbələrinin görüşünə gəlməyib. Heç 1978-1982-ci illərdə onlara atalıq qayğısı göstərmiş dekan, dosent Musa Həsənov da yoxdur. Onlar "dərsə" gəlmədilər, heç vaxt da gəlməyəcəklər... Çünki çoxdan haqq dünyasına qovuşublar... Allah rəhmət eləsin!

Tədbirin sonunda görüş iştirakçıları xatirə şəkli çəkdirib, tədris binası ilə yaxından tanış olublar.

## Kimya və biologiya fakültəsinin Elmi Şurasının iclası

Yanvarın 24-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Kimya və biologiya fakültəsinin Elmi Şurasının iclası keçirilib. Kimya və biologiya fakültəsinin dekanı, Elmi Şuranın sədri, dosent Elnarə Mehbalıyeva gündəlikdə olan əsas məsələüzvlərinin nəzərinə çatdırılıb.

İclasda "Kimya müəllimliyi" və "Biologiya müəllimliyi" ixtisasları üzrə IV tədris ili tələbələrinin pedaqoji təcrübəsinə hazırlıq haqqında Biologiya və onun tədrisi metodikası kafedrasının müdiri, dosent Anaxanım Yusifo-



va və Ümumi kimya və kimyanın tədrisi metodikası kafedrasının müdiri, kimya üzrə fəlsəfə doktoru Reyhan Ağayevanın məlumatları dinlənilib.

2017-2018-ci tədris ilinin payız semestrinin imtahan sessiyasının gedişi haqqında ətraflı məlumat verib. Dosent E.Mehbalıyeva bildirib ki, Kimya və biologiya fakültəsində payız semestrinin imtahan sessiyasında müxtəlif tədris illəri üzrə tədris planında nəzərdə tutulan fənlərdən imtahanlar keçirilib. Həmin fənlər üzrə yanvarın 24-nə kimi keçirilən imtahanların nəticələri Elmi Şura

Sonra iclasda iştirak edən doktorant və dissertantların attestasiyası məsələsi də müzakirə olunub.

Elmi katib Gülnarə Babayeva cari məsələlərlə də Elmi Şura üzvlərini tanış edib.

## ADPU-nun nəzdində ADPK-də 20 Yanvar şəhidləri anılıb

Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) nəzdində Azərbaycan Dövlət Pedaqoji Kollecində (ADPK ) 20 Yanvar faciəsinə həsr olunmuş "Azadlığa gedən yolun zirvəsi" adlı tədbir keçirilib. Tədbirdə ADPK-nin rəhbərliyi, müəllim və tələbə heyəti, Yasamal Rayon İcra Hakimiyyətinin (RİH) nümayəndələri, 20 Yanvar hadisəsinin iştirakçıları və başqaları iştirak ediblər. Tədbirdə əvvəlcə 20 Yanvar faciəsində həlak olmuş şəhidlərimizin xatirəsi bir dəqiqəlik sükutla yad edilib.

Tədbirdə bildirilib ki, Azərbaycan xalqının tarixinə Qanlı Yanvar faciəsi kimi daxil olmuş 1990-cı ilin 20 Yanvar faciəsindən iyirmi səkkiz il keçir. Keçmiş Sovet dövlətinin hərb maşınının həmin gün Azərbaycan xalqına qarşı həyata keçirdiyi vəhşi terror aktı insanlığa qarşı törədilmiş



ən ağır cinayətlərdən biri kimi bəşər tarixində qara səhifə olaraq qalacaqdır.

Tədbirdə ADPK-nin direktoru, hüquq üzrə fəlsəfə doktoru Qulu Novruzov çıxış edərək bildirib ki, xalqımızın yaddaşına silinməz faciə kimi yazılmış 20 Yanvar faciəsi tariximizin qəhrəmanlıq səhifəsidir. 20 Yanvar günü uzun illər Sovet imperiyasının əsarətində yaşayan xalqın azadlıq səsini ucaltdığı, öz müstəqilliyi uğrunda cəsarət nümayiş etdirdiyi şərəfli bir tarixdir.

Tədbirdə həmçinin I qrup Vətən müharibəsi əlili Arif Məhərrəmov və BDU-nun professoru İdris Əhmədov həmin günlərdə şahidi olduqları hadisələrdən ürəkağrısı ilə danışıblar.

ADPK-nin tarix müəllimi Nailə Zaliyeva isə Sovet imperiyasının başında duran M.Qorbaçovun qanunsuz hərəkətlərindən söz açıb.

Tədbirdə 20 Yanvar faciəsinə həsr olunmuş videoçarx və ədəbi-bədii kompozisiya nümayiş etdirilib.

## ADPU-nun Ağcabədi Filialında "20 Yanvar faciəsi xalqımızın qəhrəmanlıq salnaməsidir" mövzusunda elmi-praktik konfrans

Yanvarın 18-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Ağcabədi Filialında 20 Yanvar faciəsinin iyirmi səkkizinci ildönümünə həsr olunmuş "20 Yanvar faciəsi xalqımızın qəhrəmanlıq salnaməsidir" mövzusunda elmi-praktik konfrans keçirildi. Tədbirdə öncə 20 Yanvar şəhidlərinin xatirəsi bir dəqiqəlik sükutla yad edildi.

baycanlıların sıxışdırılması və bütün bu baş verənlərə SSRİ rəhbərliyinin seyrci mövqeyi, ermənilərə havadarlıq etməsi xalqımızı hiddətləndirmişdi. Həmin dövrdə Azərbaycanda hakimiyyətdə olan qüvvələrin mövqeyi kəskin etirazlara səbəb olmuşdur. Onların yarıtmaz və yarasız fəaliyyəti xalqla hakimiyyət arasında keçilməz uçurum yaratmışdı.

canlılar qarşısında çıxış etmiş, baş vermiş faciəyə öz münasibətini bildirmişdir. Cəsarətlə SSRİ rəhbərliyini, şəxsən M.Qorbaçovu günahlandırmışdı. 1990-cı ilin noyabrın 21-də böyük siyasi xadim Heydər Əliyevin rəhbərliyi ilə Naxçıvan Muxtar Respublikasının Ali Məclisi 20 Yanvar faciəsi ilə bağlı tarixi qərar qəbul etdi.

Ulu öndər Heydər Əliyev xal-



Konfransı giriş sözü ilə açan filialın direktoru, dosent Mətanət Fərzəliyeva bildirdi ki, xalqımızın tarixində qəhrəmanlıq səhifəsi olan 20 Yanvar faciəsindən iyirmi səkkiz il keçir. SSRİ-nin hərb maşınının həmin gün Azərbaycan xalqına qarşı həyata keçirdiyi təcavüz insanlığa qarşı törədilmiş ağır cinayətlərdən biri kimi tarixdə qalacaqdır. 20 Yanvar qırğını nə qədər faciəli olsa da, Azərbaycan xalqının iradəsini, milli-azadlıq uğrunda mübarizə əzmini qıra bilmədi.

Sonra məruzələr dinlənildi.

Filialın tərbiyə işləri üzrə direktor müavini, dosent əvəzi Mahir Səlimov "20 Yanvar faciəsi və onu törədən səbəblər" mövzusunda məruzə etdi. Natiq öz çıxışında 20 Yanvar faciəsi və onu törədən səbəbləri göstərərək qeyd etdi ki, ermənilərin Azərbaycana qarşı 1988-ci ildən başlanan əsassız ərazi iddiaları nəticəsində Ermənistanda yaşayan azərbaycanlıların öz doğma yurdlarından qovulması, onlara qarşı törədilən cinayətlər, Dağlıq Qarabağ Muxtar Vilayətində yaşayan azər-

"20 Yanvar faciəsi milli məfkurəmizin azadlıq istəyinin oyanış günü idi" mövzusunda məruzə edən dosent əvəzi Tahir Kərimli göstərdi ki, Sovet imperiyasının bu qanlı hadisənin törədilməsində əsas məqsədlərindən biri, öz haqlı tələblərini irəli sürən, istiqlaliyyət, azadlıq istəyində olan Azərbaycan xalqının iradəsini qırmaq, insanların müstəqillik arzularını tankların tırtılları altında əzmək idi. Xalqımıza qarşı misli görünməmiş qəddarlıq etsə də, imperiya istəyinə nail ola bilmədi. Xalqımızın müstəqilliyə gedən yolu dönməz oldu.

"Ümummilli lider Heydər Əliyev tərəfindən 20 Yanvar faciəsinə verilən siyasi-hüquqi qiymət" mövzusunda məruzə edən dosent Məhəmməd Hüseynov öz məruzəsində Ulu Öndərin 20 Yanvar faciəsinə verdiyi siyasi-hüquqi qiyməti şərh edərək qeyd etdi ki, ümummilli lider Heydər Əliyevə qədər bu faciəyə obyektiv, düzgün qiymət verilməmişdir. Hadisədən bir gün sonra Heydər Əliyev Moskvadakı Azərbaycan nümayəndəliyinə gələrək, azərbay-

qın təkidi ilə yenidən hakimiyyətə qayıtdıqdan sonra bu məsələ yenidən gündəmə gəldi. 20 Yanvar faciəsini lazımınca qiymətləndirmək yolunda ciddi addımlar atıldı. "20 Yanvar faciəsinin 4-cü ildönümünün keçirilməsi haqqında" Azərbaycan Respublikasının Prezidenti Heydər Əliyevin 5 yanvar 1994-cü il tarixli fərmanı ilə Milli Məclisə 20 Yanvar hadisələrinə tam siyasi-hüquqi qiymət verilməsi tövsiyə olundu. Milli Məclisdə müzakirələrin yekunu olaraq 1994-cü il martın 29-da "1990-cı il yanvarın 20-də Bakıda törədilmiş faciəli hadisələr haqqında" qərar qəbul edildi. Qərarda 1990-cı ilin qanlı 20 Yanvar faciəsinə dövlət səviyyəsində siyasi-hüquqi qiymət verildi.

Sonra məruzələr ətrafında çıxışlar dinlənildi. Çıxış edənlər 20 Yanvar faciəsi qurbanlarının şərəfli əməllərinin Azərbaycan xalqının qəlbində daim yaşayacağını, milli qürur və iftixar rəmzi olacağını bildirdilər.

Sonda 20 Yanvar faciəsi ilə bağlı sənədli film nümayiş etdirildi.

## ADPU-nun Quba Filialında 20 Yanvar faciəsinin iyirmi səkkizinci ildönümünə həsr olunmuş silsilə tədbirlər

Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Quba Filialında 20 Yanvar faciəsinin iyirmi səkkizinci ildönümünə həsr olunan silsilə tədbirlərə filialda təsdiq olunan tədbirlər planına müvafiq olaraq yanvarın əvvəlindən başlanılıb.

çıxış edərək 1990-cı ilin 19-20 yanvar tarixlərində Bakıda törədilmiş faciəli hadisələrdən ətraflı danışıblar. Sonra "Azərbaycan dili və ədəbiyyat müəllimliyi" ixtisasının IV tədris ili tələbələrinin hazırladıqları şeir və çıxışlar dinlənilib.



Yanvarın 10-da filialın "Oxucu" divar qəzetində "20 Yanvarqan yaddaşımız" mövzusunda yazı dərc olunub, filialın kitabxanasında "Quba şəhidləri " mövzusunda dəyirmi masa keçirilib.

Yanvarın 16-da filialda "Unutmayaq, unutdurmayaq!" mövzusunda tədbir keçirilib. Tədbirdə filialın direktoru, professor Əli Allahverdiyev, tərbiyə işləri üzrə direktor müavini Aysel Şeydayeva, Ədəbiyyat və dillər kafedrasının müdiri, dosent Gülşən Ağabəy

Sonda "Azərbaycan tarixinin yaralı vərəqələri" adlı videoçarx nümayiş olunub.

Yanvarın 17-də filialın tələbə və müəllim kollektivi Quba şəhərində yerləşən Şəhidlər Xiyabanını və Şəhidlər Muzeyini ziyarət edib.

Yanvarın 20-də filialın kollektivi 20 Yanvar faciəsinin iyirmi səkkizinci ildönümünə həsr olunan ümumrayon tədbirində iştirak edib, şəhid məzarları üzərinə əklil və gül dəstələri qoyub.

# İqtisadi dünyagörüşü

Sivil cəmiyyəti səciyyələndirən ən tutumlu, statuslu anlayışlarından biri "dünyagörüşüdür". "Dünyagörüşü" anlayışı fəlsəfi, sosial-psixoloji, emosional, mənəvi, etik, mədəni, multikultural, ictimai-siyasi, iqtisadi və s. səciyyəyə malik olmaqla, müxtəlif çalarlı komponentləri özündə cəmləşdirir. "Dünyagörüşü" geniş tutumlu anlayışdır. Geniş mənada dünyagörüşü insanın yaşadığı aləmə-dünyaya baxışları sistemidir. Dünyagörüşü insanın məskunlaşdığı təbii-coğrafi şəraitdə baş verən təbiət hadisələrinin dərk edilməsi, öyrənilməsi, həmçinin onun yaşadığı cəmiyyətdə, sosial mühitdə digər insanlarla ünsiyyətdə, əlaqə və münasibətlərdə olması nəticəsində əldə etdiyi məlumatların, biliklərin toplusudur. Dünyagörüşü insanın yaşadığı dövrün bütün mərhələlərində, onun ömrünün hər anına uyğun formalaşır. Hər bir fərdin - insanın, şəxsiyyətin dünyagörüşü olduğu kimi, insanların sadə birliklərinin, sosial qrupların, təbəqələrin, ali səviyyədə cəmiyyətin də özünəməxsus dünyagörüşü olur.

Dünyagörüşünün məzmunu, strukturu insanın, sosial toplumun, birliyin intellektual, bilik və mədəni səviyyəsinə istinadən formalaşır və zənginləşir. İntellektual və mədəni səviyyənin aşağı olması məhdud, qapalı, xülyəvi dünyagörüşü yaradır. Bu halda insan həyatda öz yerini tapa bilmir, problemlərinin həll edilməsində, ortaya çıxan suallara cavab verməkdə çətinlik çəkir. Cəmiyyətdə ləng mövqeydə dayanır.

Dünyagörüşünün formalaşmasında, təşəkkülündə məlumatlar, biliklər, dərketmə, düşünmə qabiliyyəti həlledici rol oynasa da, bu prosesə insanın fərdi həyati baxışları, emosiyaları da təsir göstərir. Belə ki, hər insanın məhəbbət, nifrət hissləri, əsəb gərginliyi intellektual biliklərlə üzvi əlaqəylə girib sintez olunmaqla həyati baxışları müəyyənləşdirir, müvafiq dünyagörüşünü şərtləndirir. Dünyagörüşü əsasında ətraf aləmin duyulması, dərk edilməsi, öyrənilməsi prosesi baş verir.

Dünyagörüşü dinamikliyə, dəyişkənliyə malik olmaqla, daim zənginləşir, yeniləşir, pozitiv çalarları özündə əks etdirir. Skeptik yanaşma dünyagörüşünə təsir göstərən amillərdən biridir. Lakin skeptsizim mütləqliyə çevrilməməlidir. Həyat təcrübəsi, düşünülmüş fəaliyyət zamanı əldə edilən informasiyalar, biliklər, dünyagörüşünün formalaşması mənbələri, potensiallarıdır. Dünyagörüşü insanın həyatda, cəmiyyətdə müəyyən mövqey tutmasında, status qazanmasında əvəzsiz rol oynayır, onun inamını, ideallarını, fəaliyyət prinsiplərini müəyyənləşdirir. Dünyagörüşü insanın fəaliyyətində məsuliyyəti artırır, məqsədə nail olmağın optimal yollarının seçilməsinə imkan yaradır.

Səciyyələrinə və məzmununa istinadən qeyd etmək olar ki, genişspektrli "dünyagörüşü" fenomen anlayışdır. Bu anlayış adi danışıqda, məişətdə işlədilməklə yanaşı elmi, akademik statusa malikdir. Dünyagörüşünə bir-biri ilə üzvi əlaqədə olan, insanın, cəmiyyətin varlığını, fəaliyyətini əks etdirən anlayış və mənaların məcmusu kimi baxmaq olar.

Dünyagörüşünə mədəniyyət kateqoriyaları sistemi ilə ifadə olunan insan dünyasının ümumiləşmiş modeli kimi də baxmaq olar. Sistemli dərketmə forması olan dünyagörüşü sübut edir ki, bir baxışla insanı, onun yaşadığı aləmi öyrənmək, dərk etmək mümkün deyildir.

Dünyagörüşü bir fenomen kimi mürəkkəb struktura malikdir. Onun daxili komponentləri, elementləri və təzahür əlamətləri vardır. Tarixi baxımdan dünyagörüşünün belə tarixi tipləri səciyyələndirilir: mifoloji, dini və fəlsəfi.

Mifoloji dünyagörüşü tipi ibtidai cəmiyyətdə meydana gələn təsəvvürlərin məcmusu kimi başa düşülür. Bu səviyyədə ətraf aləm bəsit, sadə görkəmdə dərk edilirdi. Mifoloji dünyagörüşü ictimai inkişafın ilkin mərhələsi olmaqla, dünyanı sadə formada anlama üsuludur, ictimai düşüncənin bəsid formasıdır. Mifoloji dünyagörüşü əfsanələrə, miflərə, insanların ibtidai adət və ənənələrinə əsaslanaraq formalaşır.

Dini dünyagörüşü tipi dini təfəkkür, dini yanaşma əsasında formalaşır. Dini dünyagörüşü inama, fövqəltəbii qüvvələrin olmasına istinadən yaranır. Dini dünyagörüşü varlıqların "dünyəvi" və "səmavi" müstəvilərdə olduqlarını iddia edir. Dini dünyagörüşünə malik olan insanın bütün həyati, fəaliyyəti Tanrıya (tanrılara) inanmağa, müxtəlif inanclara, etiqadlara əsaslanır.

Fəlsəfi dünyagörüşü tipi yetkin nəzəri sistemdir. Başqa sözlə, mifoloji və dini dünyagörüşlərindən fərqli olaraq, fəlsəfi dünyagörüşü dərin düşünməyə, intellektə, analiz və sintezə əsaslanan elmi baxışlar sistemidir. Əgər mifologiya emosiyalara, hisslərə əsaslanırsa, fəlsəfə ciddi məntiqə və sübuta üstünlük verir. Dindən fərqli olaraq fəlsəfə azad düşüncəyə istinad edir.

Mürəkkəb qurulşa malik olan dünyagörüşünün spektri olduqca genişdir, onun əhatə dairəsi müxtəlif səviyyələrlə və istiqamətlərlə ölçülür. Dünyagörüşü fərdin özünü dərk etməsindən başlayaraq ictimai müstəviyə keçir. Bu halda ayrı-ayrı insanların və sosial qrupların, insan biliklərinin dünyaya baxışlarında real fərqlər özünü göstərir. Dünyagörüşü yaşdan, sosial mühitdən, peşə və ixtisas seçimindən, cəmiyyətin mədəni inkişaf səviyyəsindən, ətrafda gedən ictimai-siyasi hadisələrdən, iqtisadi münasibətlərdən asılı olaraq dəyişə və zənginləşə bilər.

Dünyagörüşü insan üçün həyati dəyərlər, ideallar, yaşamaq üsulları, nümunələri və s. müəyyənləşdirməklə, onun məqsədinə çatmaq yollarını asanlaşdırır. Fərdi dünyagörüşlərinin səviyyəli məcmusu əsasında xalqın, millərin mentaliteti formalaşır, cəmiyyət üçün zəruri olan ictimai normalar, qaydalar müəyyənləşir.

Dünyagörüşünün formalaşması, strukturu, zənginliyi müxtəlif amillərin təsiri altında baş verir. Fərdi mənsubiyyətə malik olan dünyagörüşünün formalaşmasına bir sıra vacib amillər təsir göstərir. Bu sırada aşağıdakıları xüsusilə qeyd etmək olar: yaş səviyyəsi, insanın ailə həyatı, yaşadığı sosial mühit, coğrafi-təbii mühit, cəmiyyətdə qərarlaşan ideologiya və baxışlar, dövlətin daxili və xarici siyasəti, həyat şəraiti və həyat tərzi, təlim və tərbiyə, kütləvi informasiya vasitələri (KİV), insanı əhatə edən kommunikativlik səviyyəsi, onu maraqlandıran mənəvi dəyərlər-mənəvi, kitablar, filmlər, sənət əsərləri və s.

Ümumi dünyagörüşü müxtəlif tiplərə ayrılmaqla geniş spektri əhatə edir. Müasir dövrdə dünyagörüşünün əhatə dairəsinin, radiusunun, istiqamətlərinin genişlənməsi prosesi baş verir. Dünyagörüşünə yeni komponentlər, maraq dairələri daxil olmaqdadır. Dünyagörüşü tiplərinin üzvi əlaqəliliyi, çuğlaşması ilə paralel, rasional, elmi dünyagörüşün üstün mövqeyə keçməsi nəzərə çarpır. Müasir insanların, xüsusən də yüksəkixtisaslı, peşəkarlığı olan gənclərin cəmiyyətdə layiqli mövqe tutmaları üçün onların yeni səviyyə və keyfiyyətdə dünyagörüşünə malik olmaları olduqca vacibdir.

Müasir dövrdə dünyagörüşü elmliyi, rasionallığı ilə seçilir. Elmi dünyagörüşü mürəkkəb struktura malik olmaqla dəqiq, əsaslandırılmış baxışların məcmusunu ifadə edir. Elmi dünyagörüşün əsasını elmi-nəzəri biliklər, idrak süzgəcindən keçən, sintez olunmuş informasiyalar təşkil edir. Belə biliklər, məlumatlar insan beyninə, şüuruna müxtəlif mənbələrdən axır. İnsanlar isə bunlardan istifadə etməklə dünyagörüşlərinin potensiallarını yaradırlar.

Ümumdünyagörüşünün müasirliyi ilə seçilən tipi olan elmi dünyagörüşün tərkib hissəsi, dinamik istiqamətlərindən biri iqtisadi dünyagörüşüdür. İqtisadi dünyagörüşü insanın yaşadığı cəmiyyətin, dövlətin, eləcə də dünyanın iqtisadi quruluşu, sosial-iqtisadi vəziyyəti haqqındakı baxışlarının toplusudur. İqtisadi dünyagörüşü insanın yaşadığı cəmiyyətdə, sosial mühitdə baş verən sosial-iqtisadi hadisələrin, proseslərin, münasibətlərin dərk edilməsi, başa düşülməsi, öyrənilməsi imkanı yaradır.

İqtisadi dünyagörüşün formalaşmasında da iki əsas tərkib komponenti mühüm rol oynayır. Birincisi, emosional hissələri əks etdirən ətraf aləmi hiss etməkdir. İkincisi isə rasional yanaşma olan dünyanı dərk etməkdir.

İqtisadi dünyagörüşün 3 əsas tipini qeyd etmək olar:

1. Adi və yaxud məişət səviyyəli iqtisadi dünyagörüş; 2. Dini-iqtisadi dünyagörüş; 3.Elmi-nəzəri və yaxud ali iqtisadi dünyagörüş.

Adi və yaxud məşiət səviyyəli iqtisadi dünyagörüş insanın real, praktiki vəziyyətini əhatə edən, gündəlik həyatda rast gəldiyi, sağlam düşüncə ilə dərk edilən məişət hadisələri, təzahürləri əsasında formalaşır. Məsələn, insanın özü, ailə üzvləri üçün zəruri olan resursların, ehtiyatların, tələbatın kəmiyyət və keyfiyyət göstəricilərinin müəyyənləşdirilməsi ilə bağlı fikirlər, mübadilə münasibətlərində, ticarətdə baş verən hadisələr, tələb-təklif, qiymət və pulla bağlı müşahidələr, yaşayış səviyyəsi, rifahla bağlı mülahizələr ilkin iqtisadi dünyagörüşün meydana gəlməsi üçün zəminlər yaradır. Real həyatda baş verən belə təzahürlər, proseslər, münasibətlər haqqında düşündükcə insanın sadə, bəsit iqtisadi baxışları sistemləşərək iqtisadi dünyagörüşün ilkin səviyyəsinə çevrilir.

İqtisadi dünyagörüşün dini mövqeydən də təzahürünün izahı vardır. İqtisadi münasibətlərin, təsərrüfat hadisələrinin, məişət məsələlərinin dini mövqeydən izahının başlanğıcı orta əsrlərin ilkin dövrlərinə təsadüf edir. İqtisadi hadisələrin, anlayışların dini baxımdan izah edilməsində sxolastik mövqeydən çıxış edənlər xüsusi rol oynamışlar. Dini kitablarda, müqəddəs yazılarda, ilahi kəlamlarında bəzi iqtisadi hadisələrə, münasibətlərə, anlayışlara, təzahürlərə özünəməxsus, fərqli izahlar verilir. Dini ayələrdə, kəlamlarda, təfsirlərdə, eləcə də xristianlığa aid olan qaydalarda, qanunlarda əmək, borc, faiz, qiymət, mülkiyyət, əmlak və s. kimi anlayışların təhlilində humanizm üstünlük təşkil edir. Məsələn, borca görə faiz almaq, kiminsə əməyindən istifadə etmək, başqasının mülkiyyətini, əmlakını almaq və s. kimi iqtisadi təzahürlər günah sayılır. Dinə görə ticarətdə mütləq halallıq olmalı, ədalətli qiymət müəyyənləşməli, zəhmətin, əməyin əvəzi layiqincə ödənilməlidir və s. İqtisadi münasibətlərin dini izahında doqmatizm olsa da, humanist yanaşma, pozitivizm belə interpritasiyaları cəlbedici edir.

İqtisadi dünyagörüşün elmi dünyagörüş formasında təşəkkülü daha əhəmiyyətlidir. Elmi -iqtisadi dünyagörüş pozitiv, dərk edilə bilən, normativ iqtisadi biliklər əsasında formalaşır.

İqtisadi dünyagörüşünün meydana gəlməsi ilkin olaraq məişət hadisələri, həyat şəraiti, ailə və sosial mühitlə, fərdi və ictimai tələbatla, insanların ünsiyyət münasibətləri və digər reallıqlarla əlaqəli olsa da, belə dünyagörüşün təşəkkülü və yetkinləşməsində təhsilin, tədris olunan iqtisad elmlərinin əvəzsiz rolu vardır. Başqa sözlə, ayrı-ayrı təhsil müəssisələrində iqtisadi biliklər verən elmlərin, tədris fənlərinin keçilməsi nəticəsində şagirdlərdə, tələbələrdə, dinləyicilərdə elmi iqtisadi dünyagörüşün formalşması reallığa çevrilir. Bu işdə vacib rol oynayan təlim prosesi elmi iqtisadi dünyagörüşünün formalaşması ilə bağlı bir sıra vəzifələr yerinə yetirilməlidir. Məsələn:

- ilk növbədə təbiət və cəmiyyət həyatının reallıqları, əsas amilləri, fəaliyyət və inkişaf qanunauyğunluqları haqqında ümumi məlumatların öyrənilməsi, onların dərk edilməsi üçün zəminlər yaradılmalıdır;

- təbiət, xüsusən də, cəmiyyət həyatında baş verən hadisələrə, reallıqlara maraq, onların mahiyyətinin öyrənilməsinə tələbat aşılanmalıdır;

- cəmiyyət, ölkə, dövlət, eləcə də hər bir insanın, ailənin və s. həyatında vacib rol oynayan sosial-iqtisadi amillərin, komponentlərin öyrənilməsinin əhəmiyyəti əsaslandırılmalıdır;

- əldə edilmiş iqtisadi biliklərin, təsəvvürlərin hər kəs üçün praktiki əhəmiyyəti, praqmatik tərəfləri izah edilməlidir;

- praktikada, real həyatda tez-tez rast gəlinən iqtisadi münasibətlər, hadisələr, anlayış və terminlərin (məsələn, börc münasibətlərinin, bank fəaliyyətinin, ticarətin, qiymətin, faizin, kreditin və s.) izah edilməsi və onların öyrənilməsinin əhəmiyyətinə xüsusi yer verilməlidir.

- iqtisadiyyatın cəmiyyət, dövlət üçün vacibliyi təbliqat yönümündə deyil, əyaniliklə, faktlarla, müqayisələrlə əsaslandırılmalıdır;

- şəxsi karyerada üstünlük qazanmaq üçün iqtisadi dünyagörüşün rolu qeyd olunmalıdır;

- cəmiyyət həyatında fəal iştirak etmək, idarəetmədə, rəhbərlikdə çevik olmaq üçün iqtisadi biliklərə malik olmağın vacibliyi əsaslandırılmalıdır;

- şəxsi marağın reallaşdırılmasında iqtisadi biliklərin vasitəçi rolu oynaması izah edilməlidir;

- əlverişli sosial-iqtisadi mühit yaratmaq üçün iqtisadi biliklərə yiyələnməyin əhəmiyyəti şərh edilməlidir;

- müasir tələblərə cavab verə bilən peşəkar işçi, mütəxəssis olmağın əsas amillərindən birinin iqtisadi dünyagörüşün olması arqumentləşdirilməlidir və s.

Qeyd olunduğu kimi, iqtisadi dünyagörüşün formalaşmasında müxtəlif səviyyəli təhsil formaları əhəmiyyətli rol oynayır. Hər bir təhsil səviyyəsində, tədris müəssisəsində iqtisadi dünyagörüşə yiyələnməyin, bu prosesin praktiki təşkilinin spesifik forma və metodları tətbiq edilməlidir. Orta məktəblərdə və yaxud bu tip tədris müəssisələrində iqtisadi biliklərin verilməsi üçün humanitar, eləcə də coğrafiya, riyaziyyat və s. bu kimi fənlərdən istifadə edilə bilər. Belə ki, bu fənlərin müvafiq mövzularında iqtisadiyyatla, təsərrüfatçılıq fəaliyyət ilə bağlı bəzi məsələləri müzakirə etmək, əyani misallar gətirmək, hesablamalar aparmaq olar.

Bakalavr, magsitratura təhsil səviyyəsində isə iqtisadiyyatla, cəmiyyətin təsərrüfat həyatı ilə bağlı müvafiq fənlərin tədris olunması iqtisadi biliklərə nail olmaq üçün şərait yaradır. Tələbələrdə, dinləyicilərdə iqtisadi fənlərə maraq yaratmaq bu fənləri tədris edən müəllimlərin peşəkarlıq səviyyəsindən, seçdiyi metodlardan və vasitələrdən çox asılıdır. Belə fənlər elə tədris olunmalıdır ki, onları öyrənmək zərurəti nəinki məişəti, həyatı, sosial şəraiti yaxşılaşdırmaq məqsədindən, həm də mənəvi tələbatdan, elmi dünyagörüşü zənginləşdirmək istəyindən irəli gəlsin. İqtisadi biliklərə yiyələnməyə marağı artırmaq məqsədilə iqtisadiyyatın cəmiyyət həyatındakı rolu, onun dövlətin bazisi, güc mənbəyi olması düzgün, məqsədli izah edilməlidir. İqtisadi hadisələrin, münasibətlərin cəmiyyət, dövlət həyatının bütün sahələri ilə üzvi əlaqəsi, qarşılıqlı təsiri məsələləri tələbələrə, dinləyicilərə lazımı səviyyədə çatdırılmalıdır.

İqtisadi biliklərə yiyələnməklə dünyagörüşü daha da genişləndirmək, zənginləşdirmək müasir dövrün zərurəti, tələbidir. Belə ki, hazırda dünya ölkələrinin mütləq əksəriyyəti yeni iqtisadi münasibətlər şəraitində yaşayırlar. Bu o deməkdir ki, bütün hallarda hər bir insan ,hətta sosial qruplar, birliklər, bütöv cəmiyyət peşə və ixtisasından, fəaliyyət sahəsindən, statusundan, karyerasından, sosial mənşəyindən asılı olmayaraq, iqtisadi münasibətlərlə qarşılaşır, iqtisadi mexanizmlərdən, vasitələrdən, iqtisadi alətlərdən istifadə edir. Belə olan halda iqtisadiyyat, təsərrüfatçılıq haqqında biliklərə, iqtisadi düşüncəyə malik olmaq əsl çıxış yolu olur. İqtisadiyyatın mahiyyətinə daxil olan qənaətçillik, səmərəlilik, effektivlik, nəticəlilik ideyaları həyati prinsiplərə çevrilməlidir.

İqtisadi dünyagörüşün formalaşmasında təlim, tədris prosesləri ilə yanaşı, tərbiyə sahəsində aparılan işlər də əhəmiyyətli rol oynayır. Xüsusən də, gənc nəslin əqli baxımdan, həmçinin əməyə müsbət münasibət yönümündə, iqtisadiyyatı başa düşmək, təsərrüfatçılıq istiqamətində tərbiyə olunması iqtisadi dünyagörüşün genişlənməsi potensialını artırar.

Mütəxəssislərin fikrincə, elmi dünyagörüşün, eləcə də iqtisadi dünyagörüşün formalaşmasında insanın elmi biliklərə yiyələnməsi ilə yanaşı, əqli tərbiyə də həlledici rol oynayır. Əqli tərbiyə geniş spektri - insanın çoxşaxəli elmi biliklərə, zehni qabiliyyətlərə yiyələnməsini, yaradıcı düşünmə bacarığının, fərdi təfəkkürünün inkişafına yönələn təlim -tərbiyə prosesini, eləcə də, əldə edilmiş nəticələrin dərk edilməsini əhatə edir. Müasir dövrdə məişət şəraitinin, rifah halının, həyat tərzinin yaxşılaşdırılması can atmaqla bərabər müxtəlifyönümlü təsərrüfatlarda, istehsalatda, ümumiyyətlə, iqtisadiyyatın bütün sahələrində, həmçinin elm və mədəniyyət sahələrində yüksək səviyyədə çalışmaq, yeni texnika və texnologiyalardan baş açmaq, çevik istifadə etmək üçün dərin bilik, müstəqil düşünmə bacarığı, güclü məntiq, dərin təfəkkür tələb olunur. Buna nail olunmasında əqli tərbiyənin əvəzsiz rolu vardır. Əqli tərbiyə digər tərbiyə istiqamətləri ilə paralel aparıldıqda öz effektini göstərə bilər. Bu sırada əmək tərbiyəsini, düzgün peşəyönümünü, xüsusən də, iqtisadi tərbiyəni qeyd etmək olar.

İnsanın şəxsiyyət statusuna yüksəlməsində əmək fəaliyəti, əmək tərbiyəsi qüvvətli amil kimi çıxış edir. Əmək tərbiyəsi kompleks vəzifələrin həyata keçirilməsini nəzərdə tutur. Başlıca vəzifə insana əməksevərliyi aşılamaq, əmək adamlarına və əməyin nəticəsi olan nemətlərə hörməti formalaşdırmaq, əmək fəaliyyətinə məsuliyyəti artırmaq, eyni zamanda əmək bacarığını və vərdişlərini yaxşılaşdırmaq, əmək mədəniyyətini yüksəltmək, gənc nəslin peşə seçiminə köməklik göstərməkdir.

Əmək tərbiyəsi iqtisadi tərbiyə ilə tamamlanmalıdır. Müasir iqtisadiyyat insanların təsərrüfatçılıq, qənaətçillik, səmərlilik fəaliyyətlərinin daha da güclənməsinə əsaslanır. Daha doğrusu, əmək fəaliyyəti iqtisadi fəaliyyətə çevrilir. Belə olan halda iqtisadi tərbiyənin güclənməsinə, təkmilləşməsinə zərurət yaranır. İqtisadi tərbiyə iqtisadi dünyagörüşün formalaşmasının əsas yollarından, işlək vasitələrindən biri kimi çıxış edir.

Bu baxımdan, cəmiyyət üzvlərini, xüsusən də, gənc nəsli iqtisadi fəaliyyətə, təsərrüfatçılıq həyatına hazırlamaq, iqtisadi təhsili, iqtisadi tərbiyəni gücləndirmək başlıca vəzifə kimi qarşıya çıxır.

İqtisadi tərbiyə insanları, xüsusən də, yeni nəsli təsərrüfatçılıq, səmərəlilik, qənaətçillik, effektivlilik ruhunda hazırlaya bilən, onları real iqtisadi fəaliyyətə qovuşduran çoxşaxəli kompleks tədbirləri əhatə edən mürəkkəb bir sistemdir.

İqtisadi tərbiyə qarşısında duran vəzifələri yığcam şəkildə belə təsnifatda vermək olar:

- insanlarda, əsasən də gənc nəsildə iqtisadiyyat, onun cəmiyyətdəki rolu, təsərrüfatçılıq fəaliyyəti, xüsusən də, biznes, sahibkarlıq və kommersiya haqqında təsəvvür, ən əsası isə iqtisadi təfəkkürü formalaşdırmaq;

- təsərrüfat həyatına yeni gələnləri, gənc nəsli psixoloji və praktiki baxımdan iqtisadi fəaliyyətə hazırlamaq;

- şagirdlərdə, tələbələrdə və digər gənclərdə qənaətcillik ruhu, şəxsi əmlaka, ictimai mülkiyyətə, xalqın sərvətinə, təbii, maddi və digər resurslara qayğıkeş münasibət formalaşdırmaq;

- təsərrüfatsızlığa, israfçılığa, tüfeyli xərclərə, korrupsiyaya, maddi və mənəvi nemətlərə laqeyd münasibətə qarşı kəskin mübarizə aparmağı tərbiyə etmək və s.

Məhz deyilənlər əsasında insanlarda, xüsusən də, gənc nəslidə intellektin əsas tərkib hissəsi, təfəkkür vasitəsi olan iqtisadi dünyagörüşü formalaşdırmaq olar.



**Vaqif Əliyev,**
**Fəlsəfə və sosial fənlər kafedrasının baş müəllimi**

# ADPU-nun Şamaxı Filialında 20 Yanvar faciəsinin iyirmi səkkizinci ildönümünə həsr olunmuş tədbir



Azərbaycan Respublikası Prezidenti Administrasiyasının rəhbəri Ramiz Mehdiyevin müvafiq sərəncamı və Təhsil Nazirliyinin əmrinə əsasən 20 Yanvar faciəsinin iyirmi səkkizinci ildönümünün keçirilməsilə əlaqədar olaraq Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Şamaxı Filialında tədbirlər planı təsdiq olunub və həmin plana əsasən silsilə tədbirlər həyata keçirilib. Belə ki, 20 Yanvar faciəsi şəhidlərinin xatirəsinə həsr olunmuş guşə yaradılıb, imtahan sessiyası müddətində məsləhət saatlarının ilk dəqiqələri bu bəşəri cinayətin tarixinə həsr olunub.

Tədbirlər planının müvafiq bəndinə uyğun olaraq yanvarın 17-də filialda anım tədbiri keçirilib. Tədbir 20 Yanvar faciəsi şəhidlərin xatirəsinin bir dəqiqəlik sükutla yad edilməsi ilə başlayıb. Sonra 20 Yanvar hadisələrinin əks olunduğu videoçarx nümayiş olunub.

Tədbiri giriş sözü ilə açan filialın direktoru, dosent Tünzalə Yusifova bildirib ki, düz 28 il əvvəl-1990-cı il yanvarın 19-dan 20-nə keçən gecə Sovet Ordusunun qoşunları tərəfindən doğma yurdunun azadlığının və öz hüquqlarının müdafiəsinə qalxmış xalqımıza qarşı, eyni zamanda insanlıq əleyhinə qatı cinayət törədilmişdir. O faciəli günlərdə xalqın səsinə hər kəsdən əvvəl səs verən məhz ümummilli liderimiz Heydər Əliyev olmuşdur. Ulu öndər Heydər Əliyevin 1990-cı il 21 yanvar tarixli bəyanatı faciəyə verilən ilk siyasi qiymət idi.

Filialın Humanitar və xüsusi fənlər kafedrasının müdiri, dosent Mayıl Alıcanov öz məruzəsində qeyd edib ki, bu tarix Azərbaycanın istiqlal yolunun ilk zirvəsi, azadlıq istəyinin oyanış günü idi. Həmin gün yüzlərlə günahsız soydaşlarımızın güllələnaran edilməsində məqsəd xalqın suverenlik uğrunda mübarizliyini məhv etmək idi. Sovet imperiyası rəhbərliyinin əsl simasının üzə çıxdığı 20 Yanvar faciəsinin qurbanlarını qədirbilən xalqımız unutmur və onların əziz xatirəsini hər zaman qürur hissi ilə yad edir. Gələcəyimizin qurucuları olan gənclər də tariximizi bilməli, müstəqilliyimiz uğrunda şəhid olmuş qəhrəmanlarımızı nümunə götürməli və dövlətçiliyimizə qarşı çevrilmiş istənilən cəhdin aradan qaldırılmasına hazır olmalıdırlar.

Tədbirin bədii hissəsində "İbtidai sinif müəllimliyi" ixtisasının III tədris ili tələbəsi Nicat Məmmədov, "İbtidai sinif müəllimliyi" ixtisasının II tədris ili tələbəsi Aytən Əhmədova, "Riyaziyyat və informatika müəllimliyi" ixtisasının I tədris ili tələbəsi Güldəstə Nəsibli və "Tarix və coğrafiya müəllimliyi" ixtisasının I tədris ili tələbəsi İltizam Ədilov Bəxtiyar Vahabzadənin "Şəhidlər" poemasını, "Azərbaycan dili və ədəbiyyatı müəllimliyi" ixtisasının II tədris ili tələbəsi Günay Məmişova isə özünün yazdığı "Azadlığı qanla yazır şəhidlər" şeirini səsləndiriblər.

Qeyd edək ki, yanvarın 20-də filialın rəhbərliyi, müəllim və tələbə heyəti Şamaxı şəhərində yerləşən Şəhidlər Xiyabanını ziyarət edəcək.

# ADPU-da təhsil alan əcnəbi dinləyicilərin "Azərbaycan dili" fənnindən imtahanı keçirilib

Yanvarın 23-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Əcnəbi tələbələrlə iş üzrə şöbəsinin dil hazırlığı kurslarında təhsil alan əcnəbi dinləyicilərin 2017-2018-ci tədris ilinin payız semestrinin imtahan sessiyası çərçivəsində "Azərbaycan dili" fənnindən imtahanı keçirilib.

İmtahanda cari tədris ilində ADPU-da ali təhsilin bakalavriat səviyyəsinin "Təhsildə sosial-psixoloji xidmət", "Məktəbəqədər təlim və tərbiyə", "İbtidai sinif müəllimliyi", "Korreksiyaedici təlim" ixtisaslarında və magistratura səviyyəsinin "Tarix müəllimliyi" ixtisasında dil hazırlığına qəbul olunmuş əcnəbi dinləyicilər iştirak ediblər.

Qeyd edək ki, ADPU-nun rektoru, professor Cəfər Cəfərovun və Beynəlxalq əlaqələr üzrə prorektoru Nigar Abbaszadənin universitetdə təhsil alan əcnəbi vətəndaşlara diqqət və qayğısı öz töhfəsini verir. Aparılan məqsədyönlü islahatların tərkib hissəsi olaraq, ADPU-da təhsil alan əcnəbi vətəndaşların təhsil və tədris prosesinə diqqətlə yanaşılır, miqrasiya məsələləri tənzimlənir, həmçinin keyfiyyəti yüksəltmək istiqamətində mühüm işlər görülür.

Hazırda ADPU-da Türkiyədən, Rusiyadan, Çindən, Gürcüstandan, Liviyadan olan 200-dən çox əcnəbi vətəndaş təhsil alır. Əcnəbi vətəndaşlar ADPU-da dövlətlərarası sazişə, Türkiyənin Ali Təhsil Şurasının (YÖK) imtahanlarının nəticələrinə əsasən, Azərbaycan Respublikası Dövlət İmtahan Mərkəzinin keçirdiyi tələbə qəbulu müsabiqəsi və ADPU-nun əcnəbi vətəndaşlarla birbaşa bağladığı müqavilələr əsasında təhsil alırlar.

# ADPU-nun Cəlilabad Filialında "Həyat üçün doğulmuşuq, Vətən üçün ölməliyik!" adlı tədbir

Yanvarın 19-da Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Cəlilabad Filialında 20 Yanvar faciəsinin iyirmi səkkizinci ildönümü ilə əlaqədar "Həyat üçün doğulmuşuq, Vətən üçün ölməliyik!" adlı tədbir keçirilib. Tədbirdə filialın direktoru, dosent Xudayar Sultanlı, direktor müavini Eyvaz Məmmədov, dekan Mənzilə Rəhimova, müəllim və tələbə heyəti iştirak ediblər. Tədbirin əvvəlində Azərbaycanın Dövlət Himni səsləndirilib, faciə qurbanlarının əziz xatirəsi bir dəqiqəlik sükutla yad edilib.



Tədbiri filialın direktoru, dosent X.Sultanlı giriş sözü ilə açaraq bildirib ki, 20 Yanvar faciəsindən 28 il ötməsinə baxmayaraq, tariximizin bu səhifəsi hər bir azərbaycanlının qan yaddaşına əbədi həkk olunub.

Direktor müavini E. Məmmədov 90-cı illərdə Azərbaycan xalqına qarşı törədilən qətliamları yada salaraq qeyd edib ki, 20 Yanvar faciəsi xalqımızın həm faciə, həm də qəhrəmanlıq səhifəsidir.

Tədbirdə filialın müəllimi Ş.Namazova geniş məruzə ilə çıxış edib. O çıxışında Vətən torpağına məhəbbət, milli ruh və azərbaycançılıq ideologiyasının dirçəlişindən danışıb.

Tədbir tələbələrin çıxışları, 20 Yanvar faciəsinə həsr olunan şeirlərin səsləndirilməsi və videoçarxların təqdimatı ilə yekunlaşıb.

# ADPU-nun Şəki Filialında 20 Yanvar şəhidlərinin xatirəsi yad edildi



Yanvarın 19-da Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Şəki Filialında 20 Yanvar faciəsinin iyirmi səkkizinci ildönümünə həsr olunmuş anım tədbiri keçirilib. Tədbirdə 20 Yanvar faciəsi qurbanlarının xatirəsi bir dəqiqəlik sükutla yad edilib.

Tədbiri giriş sözü ilə açan filialın direktoru, riyaziyyat üzrə elmlər doktoru, dosent Rafiq Rasulov 20 Yanvar hadisələrinin xalqımızın istiqlal mübarizəsi tarixində şərəfli bir gün olduğunu qeyd edib, milli müstəqilliyimizin bərpasında həmin hadisələrin xüsusi rolu olduğunu vurğulayıb.

Çıxış edən elmi işlər üzrə direktor müavini, dosent Nuralı Çələbiyev, kafedra müdiri, professor Firədun İbrahimov və kafedra müdiri, tarix üzrə fəlsəfə doktoru Vüsal Baxışov 20 Yanvar hadisələrinin baş vermə səbəbləri, onun ağır nəticələri, ulu öndər Heydər Əliyevin bu dəhşətli cinayətə görə etiraz əlaməti olaraq göstərdiyi qətiyyətli və prinsipial mövqeyi tədbir iştirakçılarının diqqətinə çatdırıblar.

Tədbirdə 20 Yanvar şəhidlərinin xatirəsinin əbədiləşdirilməsi, onların ailələrinə göstərilən dövlət qayğısından bəhs olunub, milli müstəqilliyimizin qorunub saxlanılmasının hər bir Azərbaycan vətəndaşının Konstitusiya öhdəliyi, şərəf və ləyaqət məsələsi olduğu bildirilib.

## Allah rəhmət eləsin!

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Məktəbəqədər təhsil, psixoloji xidmət və korreksiyaedici təlim fakültəsinin dekanı Şəhla Əliyevaya, qayınatası
**Seyidağa Həmidovun**
vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

---

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Azərbaycan dilçiliyi kafedrasının professoru Nəbi Əsgərova, əzizi
**Möylam Zeynalovun**
vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

---

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Türk və Şərqi Avropa xalqlarının tarixi və tarixin tədrisi metodikası kafedrasının dosenti Səidə Məmmədovaya, qardaşı
**Ənvər Məmmədovun**
vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

---

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Fəlsəfə və sosial fənlər kafedrasının müəllimi Fazilə Hüseynliyə, anası
**Şahniyar xanımın**
vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

---

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi İnsan və heyvan fiziologiyası kafedrasının müəllimi Jalə Qafarovaya, anası
**Ədilə xanımın**
vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

Redaktor: Nigar ABBASOVA
Məsul katib: Mahirə MUSTAFAYEVA

ÜNVANIMIZ: Bakı, Ü. Hacıbəyli küçəsi, 68 ADPU, Tel.: 498-18-41

Məqalələrdəki faktlara görə redaksiya məsuliyyət daşımır

ADPU-nun web-portalı: adpu.edu.az
Fotolar Nurlan Səmədovundur
Şəhadətnamə № 191

Sifariş: 315
Sayı: 1500
Çapa imzalanıb: 31.01.2018-ci il

ADPU-nun İctimaiyyətlə əlaqələr və marketinq şöbəsində yığılıb, "Azərbaycan" Nəşriyyatında səhifələnib və ofset üsulu ilə çap edilib.